**Rəyçi:** **Kamil Adişirinov**
*filologiya üzrə fəlsəfə doktoru*

**Ə.M.Abdullayev.**
**Şəkinin XVIII-XIX əsr şairləri.**
Bakı: 2020,– 160 səh.

*Kitabda Şəkinin XVIII-XIX əsrdə yaşayıb yaratmış görkəmli şair və aşıqları barədə qısa da olsa tanışlıq verməklə düşünürük ki, bu ədəbiyyat tarixi ilə maraqlananlar üçün töhvə olacaqdır.*

*Qeyd etməliyik ki, kitabı Əbdürəhman müəllim sağlığında nəşr etdirməyə çalışmış lakin, nədənsə, kitab nəşr edilməmiş və üstəlik əl yazması da itirilmişdir.*

*Biz, Əbdürəhman müəllimin ruhuna hörmət əlaməti olaraq, çətinliklə olsa da, kitabın digər əlyazması nüsxəsini taparaq, onu nəşr etdirmək qərarına gəldik.*

ISBN 978-9952-475-35-7



# MÜƏLLİFDƏN

Müasir dövr ziyalılarımızı keçmişi öyrənməyə, unudulmuşları axtarıb tapıb xalqa tanıtdırmaq üçün tarix və ədəbiyyatda əmələ gələn boşluğu doldurmağa təhrik edir.

Bu bir həqiqətdir ki, keçmişimizi öyrənmədən bu günümüzü düzgün qiymətləndirmək çətindir. Bu hər şeydən əvvəl gələcək nəslə keçmişimizi dolğun və obyektiv surətdə aydınlaşdıran bütöv bir irs qoymaq üçün lazımdır.

Şəkinin bugünkü mədəni və elmi inkişafını qiymətləndirmək üçün onun keçmişinə, heç olmazsa, XVIII-XIX əsrlərdəki ədəbi və elmi simasına nəzər salmaq lazımdır. Hər bir xalq müəyyən dövrdə istedadlar yetişdirir. Bu istedadların hamısı klassiklər səviyyəsinə qalxmasalar da, bəşəri əsərlər yarada bilməsələr də mühitinin və özünün səviyyəsində yazılan ədəbi və elmi irs qoyub getmişlər.

XVIII-XIX əsrlərdə Şəkidə yetişən bədii sənət və elm adamları da bu qəbildəndirlər. Bu əsrlərdə sənət və elm adamlarının adlarına tək-tək hallarda bir sıra tarix və ədəbiyyatşünaslığa dair çap olunan və ya əlyazmalar şəklində qalan elmi və publusistik mənbələrdə təsadüf edilir. Bu adları müxtəlif mənbələrdən toplayıb, onların haqqında qısa da olsa izahat verməklə, aydın olur ki, XVIII-XIX əsrlərdə Şəkinin özünə məxsus ədəbi və elmi siması olmuşdur.

Bu əsrlərdə Şəkidə Nəbi, Süleyman, Hacı Məhəmməd, Zare, Məhəmməd hüseyn xan Müştaq, İsmayıl bəy Nakam, Molla Yüsif Raci, Kərim ağa Fateh, Molla Qasım

Zakir, Şuxi, Hüzni, Hüseyn Qəmnək, Dəli Bəbir, Molla Məhəmməd, Hacı Rəsul, İbrahim əfəndi Nicati, Hacı Mahmud Əfəndi, Nafe, Hacı Rəsul, Rəsul dülgər, Xəstə Qadir, Məhəmməd Şəmədüz, Molla İbrahimxəlil Dodui və başqa şairlər, M.F.Axundov kimi şair, dramaturq, nasir, filosof, ədəbi tənqidçi və tərcüməçi, İsmayıl bəy Nakam kimi maarifçi, Rəşid Bəy Əfəndiyev kimi şair, nasir, dramaturq, ədəbi tənqidçi, tərcüməçi və maarifçi, Molla Cuma, Novruz və Danu xalq aşıqları yaşayıb yaratmışlar. Bu şair və alimlərin kimi xalq aşıqları yaşayıb yaratmışlar. Bu şair və alimlərin bu gün əlimizdə olan bir neçə ədəbi, elmi irsi F.Köçərli, Hüseyn əfəndi Qayıbov, Rəşid bəy Əfəndiyev, Salman Mumtaz, Əli Abbas Münzib, Həmid Araslı və Əbdüləzəl Dəmirçizadənin axtarış və tapıntılarının, Əlyazmalar İnstitutunun qayğıkeş mühafizəsinin məhsulu və xidməti nəticəsində mövcuddur.

O dövrlərdəki Şəkinin elmi potensialına gəldikdə qeyd etmək lazımdır ki, Molla İsrafil Bideyizi, Kərim ağa Fateh, Əbdüllətif Əfəndi (Nuxəvi), Rəşid bəy İsmayılov, Məmməd Həsən Mollazadə və başqaqarı ədəbiyyatşünaslığa və tarixə aid əsərlərin müəllifləri olmuşlar. M.F.Axundov və R.Əfəndiyev istisna edilərsə, qeyd edilən şairlərin çap kitabları olmamış, onların bəzi şeirləri poeziya həvəskarları tərəfindən əlyazmalar şəklində saxlanmış və mühafizə edilmişdir ki, bunların müəyyən hissəsi Əlyazmalar İnstitutunda toplanmışdır.

Elmi- kütləvi xarakter daşıyan bu kitab ön söz və üç hissədən (el şairləri, qadın şairlər və xalq aşıqları) ibarət olmaqla, bütün oxucular, xüsusilə poeziyamızın kökləri ilə maraqlanan ədəbiyyat həvəskarları üçün yazılmışdır.



# ÖN SÖZ

## ƏDƏBİYYATIMIZIN QARANLIQ SƏHİFƏLƏRİNƏ İŞIQ SALAN QİYMƏTLİ TOPLU

1997-ci ilin yazı idi. Görkəmli geoloq alim, AMEA-nın Şəki Regional Elmi Mərkəzinin direktoru Zəkəriyyə Əlizadənin göndərişi əsasında "XX əsr Şəki ədəbi mühiti" mövzusu üzrə dissertasiya işinin yerinə yetirilməsi xahişi ilə AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutuna göndərilmişdim. Bərk həyəcan keçirirdim. Ədəbiyyat İnstitutunun direktoru, görkəmli ədəbiyyatşünas, nəzəriyyəçi alim, professor Yaşar Qarayev məni çox mehribancasına qarşılayaraq niyyətimizi alqışladı. Söhbət əsnasında Yaşar müəllim mənə ömrünün çox hissəsini ədəbiyyatşünaslıq elmimizin inkişafına və tədqiqinə həsr etmiş, hazırda Şəkidə yaşayan qocaman ədəbiyyatşünas alim Əbdürrəhman Abdullayevi tanıyıb-tanımadığımı soruşdu. Düzü, mən Əbdürəhman müəllimlə şəxsən tanış olmasam da, onun XVIII–XIX əsrlər Şəki ədəbi mühiti ilə, xüsusilə XX əsrin görkəmli maarifçisi Rəşid bəy Əfəndiyevlə bağlı yazılarını demək olar ki, əzbər bilirdim. Yaşar müəllimə Əbdürəhman müəllimi əsərlərindən tanıdığımı bildirdim. Görkəmli ədəbiyyatşünas mənə dedi ki, səni Əbdürəhman müəllimin yanına göndərəcəm, o, sənə dissertasiyanın yerinə yetirilməsi üzrə elmi rəhbər kimi istiqamət verəcək. Yüksək sevinc hissi ilə Şəkiyə qayıtdim. Alimin yaşadığı məkanı xəbər aldıqda bildirdilər

ki, Qışlaq ərazisində yaşayır. Ünvanı soruşa–soruşa Əbdürəhman müəllimin yaşadığı evi tapdım. Demə, Əbdürəhman müəllim Şəkinin ictimai-siyasi həyatında mühüm rol oynamış Şəkinin adlı-sanlı ziyalılar nəslinə mənsub olan bir insan imiş. Kiçik qardaşı, əvvəllərdən yaxşı tanıdığım Soltan müəllimin bələdçiliyi ilə qocaman ədəbiyyatşünasla görüşdüm. İlk görüşdən Əbdürəhman müəllimin yaşının ixtiyar çağı olmasına baxmayaraq, nəinki ədəbiyyat fədaisi, həmçinin yüksək əməksevər bir insan olduğunu hiss etdim. Səksəndən yuxarı yaşı olsa da, bu müdrik qoca babalarımızın müqəddəs: "İstəyirsən bol çörək, al əlinə bel-kürək" deyimini əsas tutaraq əkinlə məşğul idi. Əlindəki işdən aralanıb İlk öncə qocaman alim məni ədəbiyyatşünaslıq sahəsində sorğu-suala tutdu. Hiss edirdim ki, verdiyim cavablar onu qane edir. Sonra masa arxasına keçdik. Əhval-ruhiyyəsindən hiss edirdim ki, bu qocaman ədəbiyyatşünas nəyinsə xiffətini çəkir. Dərin düşüncələrdən ayrıldıqdan sonra o, üzünü mənə tutaraq: Bu yaxınlarda Bakıya gedəcəksənmi, ay oğul, - dedi. Mən gedəcəyimi bildirdim. O, üzüntülü halda soruşdu: "Azərnəşr"i tanıyırsanmı? Mən tanıdığımı bildirdim. Səndən bir xahişim olacaq. Gedərsən ora, nəşriyyatın direktoruna bildirərsən ki, sizdə Əbdürəhman müəllimin "Şəkinin XVIII–XIX əsr şairləri" kitabının əlyazması var, o nə vaxt nəşr olunacaq? Nəşr xərci də artıq ödənilib.

Əbdürəhman müəllimin tapşırığını yerinə yetirmək məqsədilə Bakıya getdim. Nəşriyyatın direktoru ilə görüşdüm. Aldığım cavab qaneedici olmadı. Şəkiyə qayıdan zaman göstərilən etinasızlığı Əbdürəhman müəllimə məyusluqla bildirdim. Qısa müddətdən sonra XX əsrdə Şəkinin





elmi həyatında mühüm rol oynamış bu görkəmli ədəbiyyatşünas dünyasını dəyişdi. Mən bu xəbərdən ikitərəfli iztirab çəkirdim. Bir tərəfdən Şəki özünün tanınmış ictimai-siyasi xadimini, ədəbiyyatşünasını itirmişdi, digər tərəfdən alimin uzun illər ağır zəhmət hesabına tərtib edərək ərsəyə gətirdiyi, bu günümüz üçün çox böyük mənəvi xəzinə olacaq "Şəkinin XVIII–XIX əsr şairləri" təzkirəsi itirilmək təhlükəsinə məruz qalmışdı...

Nəhayət, illər keçdi. Mən "XX əsr Şəki ədəbi mühiti" mövzusunu deyil, görkəmli Akademik Bəkir Nəbiyevin tövsiyəsi üzrə XIX əsrin görkəmli Nizami və Füzuli davamçısı, qəzəl ustadı, şəkili şair İsmayıl bəy Nakamın həyat və yaradıcılıq yolunu dissertasiya mövzusu kimi yerinə yetirərək 2013-cü ildə AMEA–nın Nizami adına Ədəbiyyat İnstitutunun İxtisaslaşmış Müdafiə Şurasında müdafiə etdim. 2017-ci ildə isə görkəmli ədəbiyyatşünas alim, Akademik İsa Həbibbəylinin məsləhəti və mənəvi dəstəyi ilə "Azərbaycan ədəbiyyatının inkişafında Şəki ədəbi-mədəni mühitinin rolu: 1901-2015-ci illər" mövzusunu doktorluq dissertasiyası mövzusu kimi yerinə yetirməyə başladım.

2020-ci ilin may ayının 24-ü. Mənim üçün ən sevincli günlərdən biri... Şəkinin tanınmış maarif işçisi Elxan Abdullayevin telefon zəngi... Əbdürəhman Abdullayevin nəşriyyatda itirilmiş əsərinin ev arxivindən digər nüsxəsinin tapılması xəbəri və həmin əsərə "ön söz" yazmaq təklifi...

Biz onunla birlikdə Əbdürəhman müəllimin kürəkəni, texika elmləri doktoru, professor Azər Qasımlı ilə görüşdük və Azər müəllim bu nüsxəni mənə təqdim etdi. Sanki Şəki ədəbi mühitində ədəbiyyatımızın şimal buzuna məruz

qalmış XVIII-XIX əsr səhifələrinə günəş hərarəti paylandı. Artıq həmin dönəmdə yaşamış şəkili şair və aşıqların həyat və yaradıcılığına edilmiş qocaman alim Əbdürəhman Abdullayevin səyahəti ilə oxucu tanış olmaq imkanı əldə edəcək. Bildiyimiz kimi, XX əsrin 90-cı illərinədək əyalət ədəbiyyatının öyrənilməsinə sovetizmdən miras qalmış ögey münasibət uzun illər Azərbaycan ədəbiyyatşünaslığında da özünü göstərmiş, nəticədə milli ədəbiyyatın inkişafını və formalaşmasını təmin edən region ədəbiyyatının öyrənilməsi diqqətdən kənarda qalmışdır. Belə ki, bu istiqamətdə aparılacaq tədqiqatlara vaxtilə vurulan "qeyri-aktuallıq" damğası uzun müddət ədəbiyyatşünaslığımızda hökmran rol oynamışdır.

Azərbaycan ədəbiyyatının ümumi mənzərəsini dərindən dərk etmək üçün ölkənin ayrı-ayrı regionlarındakı ədəbi mühitlərin öyrənilməsi zərurudir. Çünki milli ədəbiyyatın formalaşması və inkişafı bölgə ədəbiyyatının inkişaf səviyyəsindən çox asılıdır. Şəki Azərbaycanın qədim mədəni və ədəbi mərkəzi olan bir şəhərdir. O, klassik və müasir ədəbiyyatımıza görkəmli ədəbi simalar bəxş etmişdir. Məlumdur ki, XVIII–XIX əsrlərdə Şəkidə onlarla şair yaşayıb-yaratmışdır. Onlar haqqında müxtəlif mənbələrdən məlumat almaq mümkündür.

Bir sıra təzkirəçi və ədəbiyyatşünaslar – Seyid Əzim Şirvani, Hüseyn Əfəndi Qayıbov, Firidun bəy Köçərli, Əbdül-Məbud Behcət, Əliabbas Müznib, Qulamhüseyn Beqdeli, Feyzulla Qasımzadə, Mirzağa Quluzadə, Həmid Araslı,Sədi Əfəndiyev, Yolçu Piriyev, türk ədəbiyyatşünası





Agah Sirri Ləvənd, şair-tədqiqatçı Vaqif Aslan Şəkinin XVIII-XIX əsrlər dönəmində yazıb-yaratmış ayrı-ayrı şairlər haqqında məlumat versələr də, bu məlumatlar (görkəmli ədəbiyyatşünaslar Firidun bəy Köçərli, Salman Mümtaz və şair Vaqif Aslan istisna olmaqla) kompleks deyil, fərdi xarakter daşımışdır.

Görkəmli alim Əbdürəhman Abdullayevin əsəri elə bir dönəmdə qələmə alınmışdır ki, Azərbaycan öz müstəqilliyini yenicə bərpa etmiş, qaranlıq səhifələrə müstəqillik projektoru işıq salmağa başlamışdı. Alim bu topluda XVIII-XIX əsrlərdə Şəkidə yazıb-yaratmış Məhəmmədhüseyn xan Müştaq, şair Nəbi, şair Süleyman, şair Hacı Məhəmməd Zare, şair İsmayıl bəy Nakam, şair Molla Yusif Raci, şair Kərim ağa Fateh, şair Molla Qasım Zakir, şair Molla Əhməd Əfəndi Zövqi, şair Hacı Mahmud Əfəndi Nafe, şair Hacı Rəsul, şair Molla Məhəmməd Hüzni, şair Rəsul Dülgər, şair Mustafa ağa Şuxi, şair Məhəmməd Şəmədüz, şair Molla İbrahimxəlil Dodui, şair Dəli Bəbir, şair Şəkili Hüseyn Qəmnak, şair Şəkili Hatəm, şair Şəkili Cami, şair Şəkili Osman Biçarə, şair Şəkili Molla Turab, şair Şəkili Lələ, şair Qışlaqlı Molla Məhəmməd, şair Göynüklü Mahmud Əfəndi, şair Padarlı Abdulla Əfəndi, şair Vardanlı Kərim (Mücrim), qadın şairlərdən Xalisə Hacı Bayram qızı, Mahtab xanım, Mah xanım, şəkili aşıqlardan Aşıq Novruz, Molla Cümə, Aşıq Doni haqqında mənbələrdən səmərəli istifadə etməklə sələflərindən və xələflərindən fərqli geniş və əhatəli məlumat vermişdir.

Ədəbiyyatşünas Əbdürəhman Abdullayev problemin öyrənilməsinə kompleks şəkildə yanaşaraq ümumilikdə öz

təzkirəsində üçü qadın olmaqla XVIII-XIX əsrlərdə yazıb-yaratmış 28 nəfər el şairinin və 3 nəfər xalq aşığının həyat və yaradıcılıq nümunələrini oxucuların diqqətinə çatdırmışdır.

İnanmaq olar ki, bu toplu Azərbaycan ədəbiyyatının əhəmiyyətli tərkib hissələrindən olan Şəki ədəbi mühitinin XVIII-XIX əsrlərdə ədəbi inkişaf səviyyəsinin öyrənilməsində ədəbiyyatşünaslar üçün mühüm mənbə rolunu oynayacaq, oxucular üçün maraqlı olacaqdır.

**Kamil Adişirinov**
*filologiya üzrə fəlsəfə doktoru*



# EL ŞAİRLƏRİ

## NƏBİ

Şəkinin XVIII əsr şairlərindən ilk tanıdığımız şair Nəbidir. Onun doğulduğu il məlum olmasa da Aşağı Künküt kəndində anadan olmuşdur. 1743-cü ildə Hacı Çələbi xanın İranın Şəkidəki hakimiyyətini ləğv edib müstəqil Şəki xanlığının bünövrəsini qoyaraq, xanlıq taxtına oturduğu zaman Nəbinin onun şərəfinə şeir yazmasını nəzərə alsaq, məlum olur ki, Nəbi XVIII əsrin əvvəllərində anadan olmuşdur. Onun üçüncü Şəki xanı şair Məhəmməd Hüseyn xan Müştaqın sarayda yaratdığı şairlər məclisinin 1779-cu ilədək üzvü olmasını və həmən il Məhəmməd Hüseyn xan öldürüldükdən sonar da xeyli ömür sürməsini nəzərə alsaq, Nəbi XVIII əsrin sonunda vəfat etmişdir.

Nəbi ağlı, kamalı, zəkası və xeyirxahlığı sayəsində yalnız yaşadığı Aşağı Künküd kəndinin əhalisi arasında deyil, həm də şəhər ziyalıları və əyanları arasında böyük hörmət və nufuz qazanmışdır. Kəndlilər onu özlərinin ağsaqqalı və məsləhətçisi hesab etmiş, şəhər ziyalıları və əyanlarının məclisləri Nəbisiz keçməmiş, onun ağıllı söhbətləri və oxuduğu şeirlər məclis əhlinin heyrət və rəğbətinə səbəb olarmış. Hacı Çələbinin xanlığını, Nadir şaha qarşı apardığı vətənpərvərlik və qəhrəmanlıq mübarizəsini vəsf edən şeirləri onun şairlik istedadını müəyyənləşdirmək üçün səciyyəvidir:

*"Ey bəyim, rəngin otağın bəzmi ürfandır bu gün,*
*Nemətin nuşi müsafir, quti mehmandır bu gün,*
*Kəfti-küyi rifətin bihəddi payandır bu gün,*





*Same olgil söyləyim mən, gör nə dastandır bu gün,*
*Şükrü həqq etmək gərəkdir, yaxşı dövrandır bu gün.*
*Şahi Nadir çün gətirdi üstünə yüz min səvər,*
*Sən bərabər cəngə durdun, kimdə var bu ixtiyar?*
*Döndü getdi xəcalətindən axır, oldu şərmüsar".*

Nəbi əsərlərində fitnə-fəsadla öz hakimiyyətlərini genişləndirməyə, başqa xalqları əsir, torpaqlarını işğal etməyə can atan şahlara, xanlara qarşı nifrətini ifadə etmiş və onların məğlubiyyətindən necə şad olduğunu izhar etmişdir. Bu cəhətdən Gürcüstan hökumdarı İraklinin hiyləsi ilə Qarabağ, Naxçıvan və Gəncə xanlarının hacı Çələbi xana qarşı bağladıqları hərbi ittifaqın Hacı Çələbi xan tərəfindən darmadağın edilməsini və xanların əsir alınmalarını ilhamla belə təsvir etmişdir:

*"Valilər cəngin yarağın qıldılar tədbir ilən,*
*Dər zaman saldın savaşı kafiri bipir ilən,*
*Gör nə bərbad oldu bidin hökumət təqdir ilən,*
*Kimini tutdun diri, kəsdin kimini şəmşir ilən.*

*Hasidü bədxahi düşmən baş ikən pay oldular,*
*Dərdi-möhnət həmnişini fikrə həmtay oldular,*
*Bəxti pamal eyləyib idbar ilən bay oldular.*

*Hər biri qəddin əyib, təzim üçün yay oldular.*
*Canü dildən xidmət eylər bəndə fərmandır bu gün".*

Nəbi, şairlik istedadına, vətənpərvərlik və insanpərvərliyinə, dostluqda sədaqət və dəyanətinə, xeyirxahlığına görə Çələbi xanın ölümündən sonra onun yerini tutan oğlu Ağakişi xan və onun da ölümündən sonra əmisinin yerini tutan Məhəmməd Hüseyn xan Müştaqın da ən yaxın dostu olmuş, onların hörmət və etimadını qazanmışdır.

Nəbi, Çələbi xan dövründə işğalçıların hücumu zamanı bərbad hala düşmüş Vətən torpağının Ağakişi xan tərəfindən abadlaşdırılmasını, onun işğalçılara qarşı mübarizədə göstərdiyi igidliyi mədh edən şeirlər də yazmışdır:

*"Çün xərab olmuş məhəllələr oldu abad sənin,*
*Sərbəsər tutdu cahanı ədl ilə adın sənin,*
*Düşmənin yari-aşna oldu tamam yadın sənin,*
*Afərin Ağakişi dilbəndi evladın sənin,*
*Pəhləvanlar sərəfrazı, mərdi-meydandır bu gün".*

Məhəmməd Hüseyn xan Müştaq Şəkini ədalətlə idarə etdiyinə görə başqa xanlıqların əhalisinin də böyük hörmət və izzətini qazandığından, Şamaxı xanlığı da onun ixtiyarına keçdikdən sonra, "Şəki-Şirvan bəylər bəyi" adını almışdı. Bundan böyük qorxuya düşən Düst Məhəmməd Şəki xalqını xana qarşı üsyana qaldırmaq üçün Nəbinin yaşadığı Aşağı Künküt kəndini talan etdiyi vaxt, xana qarşı üsyan edən kəndliləri inandırmış ki, xanın bu talandan xəbəri yoxdur. Məhəmməd Hüseyn xan bu xəbəri eşidib süvari qoşunu ilə Şamaxıdan kəndə gələrək, üsyançıları cəzalandırmaq istədikdə, Nəbi onu inandırmış ki, bu üsyanda xalq





təqsirkar deyil, bunun səbəbkarı Düst Məhəmməddir. Beləliklə də, kənd əhlini xanın cəzasından xilas etmişdir.

Nəbi xalqın maariflənməsi üçün çalışan elm və mərifət sahiblərinə böyük hörmət bəsləmişdir. Onlardan biri olan Hacı Çələbi, Ağakişi və Məhəmməd Hüseyn xanların məsləhətçisi və müşaviri olan Hacı Sədrəddin bəyə xüsusi ehtiram göstərmişdir:

*"Çünki Sədrəddin əfəndi qəmküsar oldu sənə,*
*Bəhri-elmü mərifət tədbirə yar oldu sənə,*
*Sidqi dildən həmdəmi-Leylü nahar oldu sənə,*
*Baisi-münqidi aləm hər nə var oldu sənə,*
*Mürşidi-ustadi-kamil piri əmir-vandır bu gün".*

Ümumiyyətlə Nəbinin şerlərinə qiymət verərkən qeyd etməliyik ki, bu şeirlər Şəki xanlığının tarixini öyrənməkdə, bu sülalənin mütərəqqi tədbirləri ilə tanış olmaq işində bizə böyük kömək edir. Bu şeirlərdən məlum olur ki, Hacı Çələbi xan ağıllı tədbirləri, hərəkətləri və cəsarəti sayəsində Şəkini İran zülmkarlarından xilas edib, müstəqil xanlığa çevirmiş, özü kimi ağıllı və cəsarətli, vətənpərvər nəsil tərbiyə etmiş, xanlıq sarayının eyş-işrət, zülm mərkəzi deyil, maarif və ədalət ocağı olduğunu xalqa göstərmiş, Nadir şah kimi qüvvətli və dəhşətli zülmkara qalib gələrək, onu biabırçı vəziyyətdə geri qayıtmağa məcbur etmişdir.

Nəbinin şeirlərindən aydın olur ki, Hacı Çələbi xanın Ağakişi bəy kimi qəhrəman oğlu, elm və mərifət mücəssəməsi olan kamil, zəkalı, ədalətli və sağlam fikirli, tədbirli Hacı Sədrəddin bəy kimi məsləhətçisi, Qasım Mirzə adlı

ad-san sahibi olan fərasətli, tədbirli vəziri, Yusifoğlu adında kamil kəşfiyyatçısı və diplomatı olmuşdur.

Nəbi şeirlərində Hacı Çələbi xanın memarlıq abidələri yaratdırmağa böyük həvəsi olan, bu sahədə əməli işlər görən, abadlıq yaradan bir xan olduğunu bədii-poetik ustalıqla ifadə etmişdir.

Nəbinin öldüyü tarix müəyyən edilməmişdir. Ancaq onun Məhəmməd Hüseyn xan dövründə yaşadığını nəzərə alaraq demək olar ki, o ya 80-ci ilin sonunda, ya da 90-cı ilin əvvəllərində doğma kəndində vəfat etmişdir.

Şeirlərindən nümunələr:

### Hacı Çələbi xana Mədhiyyə

Ey bəyim, rəngin otağın bəzmi tufandır bu gün,
Nemətin nuşi-müsafir quti meymandır bu gün.
Kövti-kuyi-rifətin bihəddin payandır bu gün,
Came olki söyləyim mən, gör nə dastandır bu gün.
Şükri həqq etmək gərəkdir, yaxşı dövrandır bu gün.

XXX

Şahi-Nadir çün gətirdi üstünə yüz min səvar,
Sən bərabər cəngə durdun, kimdə var bu ixtiyar.
Döndü getdi xəcalətindən axır, oldu şərmüsar,
Rəhnümadır əbnayi-nüsrəm verən pərvərdigar,
Dəstgirin Şahmərdan şiri-yəzdandır bu gün.

XXX

Valilər cəngin yarağın qıldılar tədbir ilən,
Dər zaman saldın savaşı kafiri tədbir ilən.
Gör nə bərbad oldu bidin hökumət təqdir ilən,





Kimin tutdun diri, kəsdin kimin şəmşir ilən.
Xəzmdar-seyf müsəlləm kafirstandır bu gün.

XXX

Doğrudur çün etiqadın, ol xudadır pəhnumun,
Bu səfa keyfiyyətin, fəhm edə bilməz hər cunun,
Sən özün kani-şücahət, dövlətin həddən füzun,
Oldu təqdiri-qəzadan günbəgün qədrin füzun
Əzmgahi-paytaxtın səqfi-keyvandır bu gün.

XXX

Hasidü-bədxahi-düşmən baş ikən pay oldular,
Dərdi-möhnət həm kişini fikrə həmtay oldular,
Bəxti pamal eyləyib idbar ilən bay oldular,
Hər biri qəddin əyib təzim üçün yay oldular,
Canü dildən xidmət eylər bəndə fərmanlar bu gün.

XXX

Çün xərab olmuş Məhəllər oldu abadın sənin,
Sərbəsər tutdu cahanı ədli ilən adın sənin,
Düşmənin yari-aşna oldu tamam yadın sənin,
Afərin Ağakişi dilbəndi-evladıq sənin.
Pəhləvanlar sərəfrazı, mərdi-meydandır bu gün.

XXX

Atı yelpa, zərbi heydər, yaş ilə bir növcavan,
Tiş-qate, sati yekrək, cəng içində kardan.
Kövtəkuyi-bibədəldirxəlqü xabi sahibzaman.
Azimi-qərari-biyan Mehdi Sahibzaman.
Məzhəpa məhü ədalət, əhdü peymandır bu gün.

XXX

Çünki Sədrəddin əfəndi cəmküsar oldu sənə,
Bəhri-elmi-mərifət tərbiyə yar oldu sənə.

Sidqü dildən həmdəmi-leylinahar oldu sənə,
Baisi-münqadi-aləm hər nə var oldu sənə.
Mürşidi-ustadı-kamil piri-Şirvandır bu gün.

XXX

Qasimi Mirzayi, əzəmdir vəxirinu nam,
Katibi mişkmin rəqəm, kani-fəsahəm xoş kəlam.
Pərdəpuşi-eyib-miskin iftixar xasyam,
Sərəvəri-dəsturi-aləm münşəyi alim-məqam.
Hər sözü bir dürrü gövhər ləlü mərcandır bu gün.

XXX

Yusif oğlu qulluğunda nazirindir bimisal,
Məsləhət binüxəlayiq nüktədant xoş məqal.
Gəlməmiş ruyi-zəminə belə mərdi-pur kəmal,
Ani lütfündən yaratmışdır xüdayi-layəzal,
Sahibi-kövrari-xəlvət sirri-pünhandır bu gün.

XXX

Layiq öz halıdır haqq dənə dövlət verməsə,
Bu əmanət sitivəsi layiq deyil hər bir kəsə.
Əhli-üfrandır bunu hər kim ki, idrak eyləsə,
Çün tamam oldu əzəl həmmami-məscidi-mədrəsə
Vəqti-dinari-müzəyyən nəqşi eyvandır bu gün.

XXX

Mən Nəbiyəm bəxti-dun ey lütfü ehsan mədəni,
Namurad olmaz cahanda kim sevər candan səni,
Dövri dərgah etmə məhrum etməyib bu bəndəni
Bəxş qıl təqsirü üzrəm salma gözdən gəl məni
Xatirim dövran əlindən xeyli virandır bu gün.





**Ağakişi bəyin ölümü münasibətilə**

Cavanlar sərvəri məqtul olubdur xasyam ağlar
Kəmali-cürətin yad eyləyib əhli-kəlam ağlar,
Ədanilər gülər vahi əalilər müdam ağlar,
Həsüdi şad olur hərdəm mühübbi sübhü şam ağlar
Təəsübdən yanar canı bilən namusu nam ağlar.

XXX

Müsəlləm oldu çün şücaət lütfü mövladən,
Sadai-hilm xoşnudi bülənd oldu məsihadən.
İmarət qıldı məscidlər dönüb kafir gəlisadən,
Əcəb kani-ədalət, ey diriğa getdi dünyadan.
Anınçün ol Məhəmməd Mehdi Sahib nizam ağlar.

XXX

Bilib məhrəm gətirdilər Qumuq xanını Şirvana,
Vəli iblisi-məlun tək fəsadı saldı hər yanə,
Ləvəndlik heyzü bidinlik bir ad oldu Dağıstanə,
Şəhid oldu gözəl canlar xəlayiq düşdü əyqanə,
Yana göy dudi-ahimdən, çəkər həsrət tamam ağlar.

XXX

Dəxi ol pur dil, ey canlar, fəna tək bir xabından ayrılmaz,
Riyasət gülşəni icrə anın tək bir gül aşılmaz,
Bu mənanı qanıb dərk eyləməz, hər bir yetən bilməz.
Məlilət bəzi əhyayə nədəndir kim əsər qılmaz,
Məzarıitani-aləmdə qəmim olmuş əzam ağlar.

XXX

Xoş o günlər anın dövründə xəlqin andan aman oldu
Vəli mərhum olandan sonra vəhşi tək rəman oldu,
Yetən fisqü fəsadə meyl edib işlər yaman oldu.

Nişani-ruzi-məhşər faş olub axır zaman oldu.
İbadətxanələr yalqız qalıb beytülhərəm oldu.
Əmiri-Sahibi-tədbir müdiri-nadiri-dövran
Olurmu bir vilayətdə anın tək vərvəri-meydan,
Nəsib etsin xuda cənnət içində neməti-əlvan,
Arizin ruhuna hərdəm bağışlar oxuyub quran,
Duai-xeyr edər dildən bənn kəmər qulam ağlar.

### Məhəmməd Hüseyn xan Müştaqa

*(Xanın Künküd kəndində baş verən üsyanı yatırtmaq üçün Şamaxıdan Şəkiyə gəlməsi münasibətilə).*

Əzmi-cəzm etdi Hüseyn xan Şirvan Künkütə,
Yerbəyer tutdurdu rahi getdi pünhan Künkütə,
Çəkdi Malı Dostməmməd, saldı talan Künkütə,
Yari qəmxar olmadı hərgiz bir insan Künkütə,
Cövr-zülm oldu cəzayi-lütfü ehsan Künkütə.

XXX

Dövləti-idbarə döndü çün fələk yar olmadı,
Əhdü peyman tərk olundu, qədri-iqrar olmadı,
Curm yox, düşmən qəvi, hakim havadar olmadı,
Ədli-divan hökm olub tənbihi-bədkar olmadı,
Qeyrilər qıldı fəsadı dəydi nöksan Künkütə.

XXX

Mərdumi-əhli-inandı qulu olmaz üstüvar,
Məsləhət törini bilməz hər lənmi-nabekar.
Yüz fəsadın babın örtər bir hakimi-namdar,





Bir neçə müsfid Şəkini eylədi bietibar,
Sikkədən saldı Nuxunu qıldı böhtan Künkütə.

XXX

Müddət idi bu arada bir məlalət yox idi,
Hər kişi həddini bilib meyli-riyasət yox idi,
Hakimin hökmündə bir tərki-ədalət yox idi,
Müddəilər niyyətində bu ədamət yox idi,
Saldı hərdəm fitnəni bir mərki-fəttan yox idi.

XXX

Bəzi kəslər bu hekayətdən xəbərdar oldular,
Rəhmü sidqiyyət mətandar səbəbkar oldular,
Qeyrəti namal edib bəxti nikünsar oldular,
Qonşu haqqın görməyib hərdəm günahkar oldular,
Xar olub xiclat çəkərlər düşsə dövran Künkütə.

XXX

Bəhs-laf vurmaq qədrdən kar hər nadan deyil,
Taki, həqdən olmadan bir qövmü fel imkan deyil,
Belə yazılmış əzəldən əmr bifərman deyil,
Doğru yoldan bu siyasət qüdrəti-insan deyil,
Gəldi təqdiriqəzadan zəhri-yezdan Künkütə.

XXX

Ey Nəbi, birdən təəssüb şəhrin abad eylədim,
Hörməti-nanü nəməkdir həqqini yad eylədim,
Ərəzi-raz edib əmirə dadü-fəryad eylədim,
Çarəsiz qaldım fərari xəlqə irşad eylədim,
Sülh olub cəng olmayıb ta düşməsin qan Künkütə.

XXX

Həmdullah, fələyin gərdişi yar oldu yenə,
Bəhsi-nüşadi de eyşi-mərdar oldu yenə,

Müddəilər ürəyi dərdi-rübar oldu yenə,
Xeyli-gümrahə-siyasət nə ki, var oldu yenə,
Mənzili əhli-nifaq əfsəl nar oldu yenə.

XXX

Bir sitəm pişədini, feli-bədadab qılıb,
Tutdu bütxanəyə üz Məbədi mehrab qılıb,
Qırdı nahaq bəşər daxili-seyrab qılıb,
Tutdu lənət yuxusu, uydub zəhəxab qılıb,
Pəstəri-xabgahi xaki məzar oldu yenə.

XXX

Bir hünər mədəni növrəstə cavan oldu zühür,
Nəsli-övladi-şərəf, Sahibi-idraki-şüur,
Oldu tənbihə siyasətkəri-ərbabi-fiğur,
Qaldı canında həsudun ələmi şa dəmi-sur,
Düşmənin puç səri məskəni mar oldu yenə.

XXX

Ər olan doğru gərək, bilmənəm əfsanə sözü,
Ərzi-sərdar edibən söylədi mərdanə sözü,
Xəbəri-cürətinin getdi-Dağıstanə sözü,
Dedi sərgərdələrə aqilü fərzanə sözü,
Sülhü mişaq oluban qövlü qərar oldu yenə.

XXX

Çünkü xan oldu Hüseyn ümməti-Şirvana bu gün,
Gəldi münqad oluban cümləsi fərmana bu gün,
Oldu-gülzari-irəm mömərü viranə bu gün,
Bülbülü qumri səda saldı gülüstanə bu gün,
Getdi əyyami-şəta fəsli bahar oldu bu gün.

XXX





Gör nə məhv oldu cahandan şəri-iblisüləin
Tabe cümlə xəcalət çəkibən oldu həzin,
Mürrü-zar oldu sərasər çəməni-ruyi zəmin,
Çıxdı seyranə əcəb hüruyi-firdövs bərin,
Söhbəti-mehr çəbin lalə üzar oldu yenə.

XXX

Düşdü dövrani siyasət deməsin kimsə xilaf,
Sözümün sidqinə şahid əsər nun ilə kaf,
Bu bəşarıt açılıb getdi xəbər qaf beqaf,
Ey dil, aşüftə bu dəm nuş edə gör badeyi-sax,
Mövsimi-tibü tərəb məstü-xumar oldu yenə.

XXX

Ey Nəbi, eylədi çərxin bizə dövranı vəfa,
Doğrudur bircə qüdrətdən olur iki fəfa,
Ayətin mənisi bu təfsir edən həm Mustafa,
Taisi rahət olub çəkdiyimiz cövrü cəfa,
Hicrü firqət ələmi vəsli-Nikar oldu yenə.

## SÜLEYMAN

Süleyman XVIII əsrin birinci yarısında Şəki şəhərində ziyalı ailəsində anadan olmuşdur. Doğulduğu il məlum deyildir. XVIII əsrin birinci yarısında anadan olmağı onunla izah edilir ki, o XVIII əsrin əvvəllərində doğulmuş ilk Şəki şairi Nəbinin müasiri olmuş, Məhəmməd Hüseyn xan Müştaqın 1760-cı illərdə sarayda təşkil etdiyi şeir məclisinin fəal üzvlərindən olmuşdur.

Süleyman lirik şair idi. Onun lirikası çox ahəngdar və mənalıdır. Məşhur ədəbiyyatşünas Salman Mumtazın verdiyi məlumata görə bu lirika o qədər gözəl və qüdrətli olmuşdur ki, böyük lirik şair olan Molla Pənah Vaqifə təsir etdiyindən, Vaqif Süleymanın şeirlərinə nəzirələr yazmışdır.

Süleymanın şeirlərində lirikanın üsiün yer tutmasını və gözəlliyini aydınlaşdırmaq üçün onun "Züleyxa" şeiri çox səciyyəvidir:

Ey simi bədən, mehri dürəxşəndə, Züleyxa,
Ey kami məlahət, ləbi pürxəndə, Züleyxa,
Qılma saçını bunca pərakəndə, Züleyxa,
Ey gözləri şəhla,
Ey qaməti rəna,
Ey saniyi leyla,
Əla,dəxi əla
Rüxsarı gözəldir.
Tuti kimi hər ləhceyi güftarı gözəldir,
Kim gördü ki, yüz ruh ola bir məndə Züleyxa.





Süleymanın vəfat etdiyi il dəqiq məlum deyildir. Ancaq 1979-cu ilə kimi Məhəmməd Hüseyn xanın saray məclislərində fəaliyyət göstərdiyindən məlum olur ki, o XVIII əsrin son rübündə vəfat etmişdir.

Şeirlərindən bir nümunə:

**Züleyxa**

Cığalı müxəmməs

Ey simi bədən, mehri dürəxşəndə, Züleyxa,
Ey kami məlahət, ləbi pürxəndə, Züleyxa,
Qılma saçını bunca pərakəndə, Züleyxa,
Ey gözləri şəhla,
Ey qaməti rəna,
Ey saniyi leyla,
Əla, dəxi əla,
Rüxsarı gözəldir.
Tuti kimi hər ləhceyi güftarı gözəldir,
Kim gördü ki, yüz ruh ola bir məndə Züleyxa.
Kim vəsmə yaxıb qaşına, gizlətdi hilalı,
Əbruyi-kamanın kibi qanrıldı xəyalı,
Ol biədəbin yoxdu məgər əqlü-kəmalı

Yox vəsmədə sevda,
Qıldı ayı rusva,
Ey düxtəri-tərsa,
Ey zülfü–çəlipa,
Bəsdir dəxi yandım,
Hər cövrə dayandım

Ey qönçə dəhan, rəhm eylə zülmündən usandım,
Bundan sora yox tabutəvan məndə, Züleyxa,
Nəsrin tökülüb şahi-ruhun tərifinə, heyhat.
Hərradi-qəza şeşdəri-heyrətdə qalıb mat,
Həqqa ki, sənin hüsnün olub aləmə isbat,
Bir mahi-liqasən,
Bir abi-bəqasən,
Bir eyşi-səfasən,
Sən əhli vəfasən,
Yox heyif ki yarın,
Sən türfə Nigarın.

Bu zinnətilə düşsə misrə, güzarın,
Hüsnün edəcək Yusifi Sərməndə, Züleyxa.

XXX

Gül, gül üzünü görmək üçün baqə çəkilmiş,
Lalə döşünü dağlayibən dağa çəkilmiş,
Qar sinəni görcək o da laylağa çəkilmiş
Ey xusravi-xavər,
Ey şəmsi-münəvvər,
Eşqin məni yeksər,
Yandırdı çü Azər.
Ey dilbəri-sərkeş,
Ey ruhi-pəriveş.
Haşa ki, zəifəm mənə urma dəxi ataş,
Bu cürə ədavət nədir səndə, Züleyxa.





XXX

Həqqa ki, sənin türfə camalında eyib yox,
Yaqut ləbində ruxi-amində eyib yox,
Hüsnündə və əqlü-kamalında eyib yox,
Bir sərvi-rəvansan,
Aşübi-zamansan,
Sən afəti-cansan,
Ey afəti-dövran,
Ey mehri-dirəşxan,
Ey şahi-Süleyman,
Qıl dərdimə sən aya Xüsrovi-xuban,
Qılmaz bu gözəllik sənə payəndə, Züleyxa.

## HACI MƏHƏMMƏD ZARE

Zarenin anadan olduğu il məlum deyildir. Ancaq Şəkinin XVIII əsrdəki ilk şairləri Nəbi və Süleymanın müasiri olduğundan məlum olur ki, XVIII əsrin birinci yarısında, Şəki mahalının Ağacayazı kəndində doğulmuşdur.

Zare Məhəmməd Hüseyn xan Müştaqın yaxın dostu olmaqla, onun saraydakı şeir məclisinin fəal üzvü olmuş, Müştaq ölənədək onun sarayında yaşamış və tənqidi şeirləri ilə şöhrət qazanmışdır.

O, sarayda yaşasa da vilayətin kəndlərini gəzərək, kəndlilərin vəziyyəti ilə yaxından tanış olmağa və gördüklərini şeirlərində tərənnüm etməyə səy göstərmişdir.

O, kənd zəhmətkeşlərinin adından Məhəmməd Hüseyn xana yazdığı mənzum ərizədə xanların kəndlilərə etdikləri zülmləri kəskin tənqid etmişdir:

"Kimisi əqli ixtiyar etdi,
Kimisi zülm işin şüar etdi...
Aqibət tutdu zülm yer üzünü,
Çəkdi fəflakə mədalət özünü".

Şair, bir parçasını göstərdiyimiz bu mənzumədə, kəndlilərin ağır, yoxsul vəziyyətini təsvir etməklə kifayətlənməyib, Məhəmməd Hüseyn xanı kəndliləri düşdükləri acınacaqlı vəziyyətdən xilas etməyə çağırır:

Çox çəkiblər bikari-darüqə,
Füqərada nə qaldı azuqə,





Naleyi-xəlq oldu ərşə dirək,
Kim edə çarə səndən özgə kömək.

Zare sarayda yaşayıb xanın qayğısı ilə əhatə olunsa da, yoxsulluq və zülmət içərisində yaşayan zəhmətkeş insanların ağır vəziyyətinə biganə qala bilməmiş, xanlardan və zəmanədən narazı olmuşdur. Buna baxmayaraq, xan ona böyük hörmət

bəsləmişdir ki, o xana belə kəskin, tənqidi məktub yazmağa cəsarət etmiş, bu məktubundan sonra da sarayda yaşaya bilmişdir.

Zare aşiqanə lirik şeirlər də yazmışdır. Təəssüf ki, tənqidi və lirik şeirlər yazmağa qadir olan Zarenin əsərlərinin çoxu nəzirələrdən ibarət olmuşdur.

Zarenin tənqidi şeirləri Qasım bəy Zakirin öz zamanəsindən şikayətçi şeirlərinə çox yaxındır. Buna görə də belə nəticə çıxartmaq olar ki, Zare Qasım bəy Zakirdən qabaq yaratdığı şeirləri ilə ona az-çox təsir etmişdir.

Zarenin şeirlərindən nümunələr:

Gecə-gündüz intizarın çəkərəm,
Aman, allah, yar əkləndi, gəlmədi,
Həsrətindən əlif qəddim bükərəm,
Aman, Allah, yar əkləndi, gəlmədi.

XXX

Gəlləm dedi, vəd eylədi, getdi,
Sözi xilaf oldi, zədədən etdi,

Səbəb nə oldi, bizi yaddan unutdu,
Aman, Allah, yar əkləndi, gəlmədi.

XXX

Bad səbah dost kuyindən gələndə,
Vergilən bir xəbər mən dərdiməndə,
Bizimlə iqrar etdi gedəndə,
Aman, Allah, yar əkləndi, gəlmədi.

XXX

Gələn varmi görüm yari gördümi,
Varıb ərz eyləyim ona dərdimi,
Billəm onda qeyrə gönül verdimi,
Aman, Allah, yar əkləndi, gəlmədi.

XXX

Aşkar oldu mənim dərdi nihanım,
Öc etdi fələkə ah və fəqanım,
Raziyəm hicrində üzülə canım,
Aman, Allah, yar əkləndi, gəlmədi.





**Mürəbbe**

Qınamayın məni, doğrusun deyim,
Məni yüz min dərdə salan yar budur.
Çox cəfasın çəkdim, vəslin görmədim,
Həsrəti canımda qalan yar budur.

XXX

Axırında zay eylədi işimi,
Tamam qan eylədi bu göz yaşimi,
İdrak fəhmimi, əql huşimi,
Sevdası sərimdə qalan yar budur.

XXX

Çox olardı aramızda ixtilaf,
Gah vurardıq məhəbbətdən laf-kaf,
Sonrası sözündə gördüm xilaf,
Hər bir sözü yalan olan yar budur.

XXX

Ey Zare doğru yoldan yol kəsmə,
Yarımamış rəqibindən dil kəsmə,
Ümidini qət edibən əl çəkmə,
Yenə çöhrəsində dolan yar budur.

## MƏHƏMMƏD HÜSEYN XAN MÜŞTAQ

Şəki xanlığının üçüncü xanı olan Məhəmməd Hüseyn xan MÜştaq istedadlı şair olmuşdur. O, şeirlərini "Müştaq" təxəllüsü ilə yazdığından, Məhəmməd Hüsen xan Müştaq kimi tanınmışdır.

O, 1743-cü ildə müstəqil Şəki xanlığını yaradan birinci Şəki xanı Hacı Çələbi xanın böyük oğlu Həsən ağanın oğludur. Şəkinin ikinci xanı olan əmisi Ağakişi bəy öldürüldükdən sonra o, Şəki xanı olmuşdur. XVIII əsrin 30-cu illərində Şəkidə anadan olmuşdur. Onun kimdən və harada təhsil alması haqqında məlumat yoxdur. Görkəmli ədəbiyyatşünas S.Mumtaz bu haqda belə yazmışdır: "Zəmanəmizə qədər əsl şairlərimiz cərgəsində Məhəmməd Hüseyn xan Müştaq adı ilə şöhrətlənən bu dost və maarifpərvər şairimizin cülus etdiyi günə kimi keçirdiyi həyatı mənə qaranlıqdır və kimdən təhsil aldığından da büsbütün bixəbərəm".

Xan olduğu müddətdə o da babası Hacı Çələbi və əmisi Ağakişi kimi mədəniyyət və abadlıq sevən bir şəxs olmuşdur. 1757-ci ildə xanlığa keçdikdən sonra xan sarayında şairlər məclisi düzəltmiş, bura Şəki şairlərindən Nəbi, Zare, Süleyman, Raci kimi şairləri cəlb edərək, onlarla bir hökmdar kimi deyil, yaxın dost kimi ünsiyyət bağlamışdır. Muştaqın ədəbi irsi klassik qəzəl səpkisində yazdığı qəzəllərdən, mədhiyə, mərsiyə və nəzirələrdən ibarətdir. Onun şeir məclisinin üzvlərindən yalnız Süleyman və Zare lirik və tənqidi şeirlər yazırdılar. Müştaq başda olmaqla qalanlar isə saray şeir ənənələrinə sadiq qalaraq, əsas etibarilə





nəzirəçilik və mədhiyyəçiliyi davam etdirir, həm də lirik şeirlər yazırdılar. Onların şeirləri əruz vəznində olmaqla, yaradıcılıq məhsullarının çoxu fars dilində olmuşdur. Azərbaycan dilində yazdıqları şeirlərində çox ərəb və fars söz və tərkibləri işlətmişlər. Bu da təbii idi. Çünki dövrün tələbi olan klassik ənənəyə uyğunlaşmağı onlar özləri üçün vacib sayırdılar.

Məhəmməd Hüseyn xan Müştaq təkcə Şəki şairləri ilə deyil, klassik poeziyamızın böyük simaları olan Vaqif və Vidadi ilə də yaxın dostluq etmiş və ülfət bağlamışdır. Hətta şeir deyişmələri də etmişdir. Bunun nəticəsidir ki, Müştaqa Vaqif və Vidadi də böyük hörmət və ehtiram bəsləmişlər. Bu ehtiramın nəticəsidir ki, Vaqif Müştaqın dəvətini qəbul edərək, Şəkiyə qonaq gəlmiş, sonradan yazdığı şeirlərdə onunla olan ünsiyyətini tərənnüm edərək, şəxsiyyətini tərif etmişdir. Müştaq Vaqifin aşiqi və pərəstişkarı olmuşdur. Bunu hiss edən Vaqif də Muştaqa eyni dərəcədə məhəbbət bəsləmiş və onunla sirdaşlıq edərək, ehtiyacını ona bildirirmiş. Buna misal olaraq Vaqifin Müştaqdan gözəl bir tüfəng istəməsini, tüfəngin göndərilməsi gecikdiyinə görə Vaqifin Müştaqa şeirlə zarafatyana yazılmış məktub göndərərək, giley-güzar bildirməsini, Müştaqın da Vaqifə həm özünün, həm də Vaqifin dostu olan Rafe ilə bir at, bir tüfəng, bir də bir kürk göndərməsinə, aşağıda dördüncü bəndi göstərilən şeir səciyyəvidir:

"Sən Qarabağ içrə qurmuşsan tələb meydanı,
Tutmusan dildə olan və düvafa Mizanını.
Görməyibsən əsbi-ehsanın məgər cövlanını?

Bir tüfəngin bu qədər sən çəkmisən hicranını.
Eylədim təslimi Rafe çeşmi ta bəsər tüfəng."

Məhəmməd Hüseyn xan Müştaqın Şəki və Şirvan xanlıqlarını bacarıqla və gözəl idarə etməsinin paxıllığını çəkən naxələf qohumları və qonşu xanlar ona düşmən kəsilmişdilər. Ən böyük düşməni Qarabağ xanı İbrahim xanın yaxın dostu, öz əmisi Əbdülqədir İbrahim xanın fitvası ilə 1779-cu ildə Müştaqı öldürərək özünü Şəki xanı elan etmişdir.

Bu hadisə Azərbaycanın hər yerində Müştaqı tanıyan və sevən xeyirxah adamlara böyük təsir edərək, onların kədərinə səbəb olmuşdur. Hətta ömründə heç kimə, heç bir bəy, xan, sultan və padşaha mədhiyyə yazmayan molla Vəli Vidadi Müştaqın ölümünə böyük "müsibətnamə" yazaraq onun şəxsiyyətini, ədalətini və şan-şöhrətini vəsf etməklə, öz dərdini, təəssüf və kədərini izhar etmişdir :

"Dinlə, ey tuğyani-möhnət bir rəvayət söyləyim,
Didələr kiryan edib şəhri-məlalət söyləyim,
Bu sözə nisbət sənə, gəl bir hekayət söyləyim,
Lütf edib qıl bir nəzər bu müxtəsər dastanə bax.
Noldu gör ol sərvəri-dövran, əmiri-möhtəşəm,
Mənbəi-cudu səxavət, mədəni-lütfü kərəm,
Mərdi-meydan, əhli-ürfan, sahibi-tirü qələm,
Ərseyi-rifətdə guya kim tikilmiş bir aləm,
Hakimi-Şirvani-Şəki, yəni Hüseyn xanə bax.

XXX





Şiri-dil bir mərd idi çox, şövkətli şani əzim,
Səfişkən, ədafikən, şəmşitizən bixafü bim,
Xoşnüma, xəndanliqa, şirin süxən, təbi həlim,
Sərvəri-sahib həşəm, ətbai çox, mülki qədim,
Neylədin, gəl, gör, müqəddir hikmətli yazdanə bax.

Vidadinin bu üç bəndini göstərdiyimiz geniş "Müsibətnamə"-si bir də onu göstərir ki, Müştaq öldürülərkən onun ev-eşiyi də tarac olunmuş, şeirlər külliyyatı da məhv edilmişdir.

Müştaqın şeirlərindən nümunələr:

**Mənim**

Ey ağalar, düşdüm taxtü-tacımdan,
Dağıldı nökərim, həm qulum mənim,
Neçə dəfə əzmi səfər eylədim,
Tırsə təbdil oldu iqbalım mənim,
Fələk bükdü belim, oxşatdı yaya,
Axıtdı yaşımı, döndərdi çaya,
Axır gündə ömrüm keçdi ah vaya,
Lap pərişan oldu əhvalım mənim,
Əcəl peymanəsi mövcə gələndə,
Əqil aynar gedə başda gizlənir,
Ölüm cəngəlində, can bazarında,
Nur çıxır çeşmədən, yaş da gizlənir.
Bu zalım zənburun gör həvəsini,

Baxübən uçurdur tək sürbəsini,
Eşidəndə tülək tərlan səsini,
Kəpənəktək quşlar daşda gizlənir.
Əlim duymaz yaza qələm, davati,
Çoxlar bu dünyada eylər vəfati,
Ürəyimin qalmayıb dəxi taqəti,
Ya altmışda, ya yetmişdə gizlənir,
Hüseyn, yüzün tut qiblə ərəbə,
Quzğun kimi bir yurd axtar xərabə,
Payız olcaq özünü vur qürabə,
Çıxar bahar fəsli qışda gizlənir.

### Vay

Ey ağalar çərxi fələk əlindən,
Möhnətim vay, ələmim vay, qəmim vay,
Bülbül idim ayrı düşdüm gülümdən,
Bağbanım vay, bülbülüm vay, gülüm vay.

XXX

Sək rəşti bir muyundan ağlaram,
Şamlar yaxıb bağrı başım dağlaram,
Bu səbəbdən ah çəkibən ağlaram,
Qohumum vay, qardaşım vay, elim vay.

XXX





Leyli köçdü, məcnun ağlar, da ağlar,
Əhvalıma sorğu ağlar, sağ ağlar,
Günəş ağlar, bostan ağlar, bağ ağlar,
Gülşənim vay, güllüyüm vay, gülüm vay.

XXX

Mən öləndə qəbrim üstə siz gəlin,
Siz ağlayın, siz sevinin, siz gülün,
Bidar qaldı qiyamətə siz bilin,
Ayrılıq vay, qəriblik vay, ölüm vay.

XXX

Qərib oldum, ayrı düşdüm elimdən,
Od tökülür həm ağzımdan, dilimdən,
Çərxi dönmüş rəhbə fələk əlindən,
Güzarım vay, əhvalım vay, halım vay.

# İSMAYIL BƏY NAKAM

Azərbaycan mədəniyyəti tarixində görkəmli xidmətləri olan məşhur maarifçi pedaqoq, ədəbiyyatşünas və tərcüməçi Firudin bəy Köçərli qiymətli ədəbi irsi olan "Azərbaycan ədəbiyyatı" kitabının 2-ci cildində Nakama yüksək qiymət verərək yazmışdır: "Nuxa şairlərinin ən məşhuru və müqtədiri İsmayıl bəy Nakamdır.

Mərhum İsmayıl yaxşı məlumat sahibi olub, xoş əxlaq, xoş rəftar bir vicud idi. Tamami Şəki mahalında əvvəlinci şair hesab olunur".

İsmayıl bəy Sədrəddinbəyov (Nakam) 1841-ci ildə Şəkidə anadan olub, orada böyüyüb boya-başa çatmışdır. Şəki və Şirvan xalqı arasında məşhur olan Hacı Seyfəddinbəyin nəslindəndir. Atası Hacı Məhəmməd bəydir.

Babası Hacı Sədrəddin bəy Şirvan və Xaldan mahallarında çoxlu torpaq sahələrinə malik bir mülkədar olmuş, bu torpaqlardan hasil olan gəlir sahəsində Nakam 40 yaşınadək firavan həyat sürmüş, bir sıra Şərq ölkələrini gəzib, görüb götürmüşdür. Bu səyahətdən sonra Nakam vaxtını mütaliə və yaradıcılığa sərf etmişdir.

Atasının ölümündən sonra bir mülkədar kimi torpaqlara sahiblik etməmişdir. Dünya malında gözü olmayan Nakam babasından qalan torpaqları təmannasız olaraq kəndlilərə paylamış və ömrünün ikinci yarısında sadə həyat sürmüşdür.

F.Köçərli Nakamın sürdüyü sadə həyatı belə təsvir etmişdir: "Qırx yaşından sonra əmlakı tamamilə əlindən çıxıb, məişəti genişlikdən darlığa mübəddəl olubdur və axiri-





ömrünü əlində baqi qalan bir parça xırda mülkdən gələn cüzi mədaxil ilə keçirmiş".Uşaqlıq dövründə xüsusi təhsil nəticəsində ərəb və fars dillərinə mükəmməl yiyələnmiş, sonra da 3 ilə qədər oxuduğu məktəbdə rus dilini öyrənmişdir.

Şərq dillərini mükəmməl bilməsi sayəsində Nizami, Sədi və Hafizin əsərlərini şəxsi mütaliə vasitəsilə öyrənib onlardan təsirlənmişdir. Füzuliyə pərəstiş etmiş, S.Ə.Şirvaniyə xüsusi rəğbət bəsləmiş və onunla dostluq münasibəti yaratmışdır. Mütərəqqi türk şairlərinin əsərlərini mütaliə etməkdən də kənarda qalmamışdır.

Yaradıcılığının məhsulu olan çoxlu qəzəl, "Leyli və Məcnun", "Fərhad və Şirin" poemaları, gənclərin tərbiyəsinə, yalançı ruhanilərin tənqid və ifşasına həsr olunmuş əsərləri 3 divanda toplanmışdır. Bu əsərlər hazırda Azərbaycan Milli Elmlər Akademiyasının Əlyazmalar İnstitutunun xüsusi fondunda mühafizə olunub saxlanılır.

Nakam gənc yaşlarından yaradıcılığa başlamışdır. Şərq ölkələrinə səyahət edənədək əsərlərini "Fani" təxəllüsü ilə yazmışdır. Səyahətdən qayıtdıqdan sonra bu təxəllüsü qəbul etdiyinə görə özünü töhmətləndirmişdir:

"Nolaydı lövhədə "fani" adın
yazanda qələm
Sınaydı ol qələm, odlanaydı
ol dəftər".

İsmayıl bəy bu peşmançılığın nəticəsidir ki, bundan sonra şeirlərində "Nakam" təxəllüsünü işlətmişdir.

Nakam dövrünün görkəmli və qüdrətli şairlərindən S.Ə.Şirvani və ehtimala görə, Xurşidbani Natəvanla müntəzəm surətdə şeirləşmiş, hətta şeir məktublarında Seyid Əzimi Şəkiyə qonaq dəvət etmişdir. Dövrünün acılıqlarından mütəəssir olan həmdərd, həmsöhbət axtaran Nakam Seyid Əzimə yazırdı:

"Qalmamış firqətini çəkməyə
aiqdə tab.
Çöhrə vəslidən eylə kərəm,
et rəfi hecab"

Seyid Əzim isə Nakama cavabında belə yazmışdır:

"Bu naməni ki, yar dil aram göndərib
Cana sərvər gönlümə ram göndərib
Bu namə iləcanə verib sərəfrazlıq
(Nakam) zar gönlümə kam göndərib
Etmiş vüsalə (Seyid) zarın ümid var
Öz mübtəlası gönlünə aram göndərib."

Nakam yaradıcılığının ən məhsuldar və kamil dövründə, şeirlərindən anlaşıldığına görə, dövründən və həyatından küskün, xanənişin, bədbin həyat tərzi keçirdiyindən Bakı, Gəncə, Qarabağın onlarca qüdrətli şairləri ilə məktublaşmayaraq, əlaqə saxlamamışdır. Şəkidə xəttatlıq dəbdə olmadığı bu şəhərin mətbuat, çap vasitələrindən məhrum olması da onun əsərlərinin yayılmasına imkan verməmişdir.





Əsərlərində sözün qüdrətini tərif etdiyinə, ana dilinə yüksək qiymət verdiyinə, aydın və saf sözün insanlar arasında dostluq, yaxşı münasibət, mehribanlıq, məhəbbət yaratmaq qüdrətinə malik olmasından bəhs etdiyi halda, özü çoxlu ərəb və fars sözləri işlətməklə şeirlərinin ahəngini ağırlaşdırmış və bu dilləri bilməyən oxucular üçün çətinlik yaratmaqla əsərlərinə geniş oxucu cəlb edə bilməmişdir.

1923-cü ildə "Şəki fəhləsi" qəzeti Nakamın əsərlərinin nəşr olunmasının vacib olduğu haqda bir məqalə dərc etdi. Bu məqalədə Nakamın sənətkarlığı xeyli tərifləndikdən sonra qeyd olunurdu ki, Nakamın fəaliyyəti, əsərləri örtülü qalmamalı, nəşr olunub xalqa çatdırılmalıdır. Çünki "Nakam Azərbaycanın Füzulisidir".

1924-cü ildə Şəkidə nəşr olunan "Bilgi" jurnalı da Nakamın ədəbi irsinə yüksək qiymət verərək, onun tərcümeyi-halını, bir neçə qəzəlini, Füzuliyə nəzirə olaraq yazdığı bir müsəddəsini çap etmiş və onun qiymətli bir insan və şair olduğu haqda bu sözləri yazmışdır: "Nakam hüsnü xilqə malik, səxi soyuqqanlı, ağır düşüncəli, bir takım xəsayilə sahib, doğruluğu və sidqi sevən bir dahi idi. Saf vicdanlı və namuslu ziyalılarla müsahibəti də çox arzu edərdi. Füzuli kimi onun da xəstə və aciz qəlbi bəşərin xəstə və aciz qəlbi kimi çarpardı. Sadə lisani kullanmaq və onu müasir vasitə edinmək məziyyətinə malik ola bilməmişdir. Eyni zamanda, həm böyük bir Nazim və həm də böyük bir şairdir."

1928-ci ildə Əliabbas Müznib Nakamın seçilmiş əsərlərini tərtib edərək, "Nakam" adlı bir kitab nəşr etdirmiş və kitaba yazdığı qısa müqəddimədə Nakamın həyatı və əsər-

ləri haqqında məlumat vermişdir. Nakamın Füzuli üslubunda qüvvətli və məzmunlu qəzəllər yazdığını, hətta Füzuli kimi onun da dövründən şikayətçi olduğunu göstərmişdir.

Bu kitabdan sonra Nakamın əsərləri dövri mətbuatda və kitab halında çap edilməmişdir.

1947-ci ildə Aleksandr Fadeyevin Şəkidəki "Nakam" kitabxanasında olarkən verdiyi "Nakam kimdir?" sualına Səməd Vurğun belə cavab vermişdi: "O, XIX əsrin ikinci yarısında "Nakam" təxəllüsü ilə yazan şair İsmayıl bəy Sədrəddinbəyovdur. Füzuli təsiri ilə çoxlu qəzəlləri var. Qəzəllərinin bəzisində dini motivlər olduğu üçün başabəla tədqiqatçıların ona vurduğu damğa nəticəsində lazımi qədər çap olunub yayılmayıb".

Nakam ateist olmadığı kimi dindar da olmamışdır. Bəzi qəzəllərində Allaha pənah, peyğəmbərə tərif duyulsa da, o dövrdə dini xurafatın qüvvətli olduğu Şəki kimi bir şəhərdə mövhumata qarşı çıxmış, din xadimlərini tənqid və ifşa edən "Dörd əfəndi" əsərini yazmışdır. Nakam bu əsərdə riyakarlığa, ikiüzlülüyə, xalqı aldadıb cəhalətdə saxlayanlara qarşı nifrət oyadırdı.

Nakam maarifpərvər bir şair olduğundan, dini mədrəsələrin əleyhinə çıxaraq, xalqı yeni üsulda məktəblər açıb övladlarını bu məktəblərdə oxutmağa dəvət etmişdir:

"Məktəb ki, əsl mərkəzidir mehr rüfətin,
Məktəbdədir mütalei ənvari izzətin,
Məktəb ki, toxm mərifətin küştikahıdır,
Məktəbdədir hüsli zürb səadətin.





XXX

Məktəb ki, bir müqəddimədir bəhs fəzildə,
Məktəbdədir nəticəsi sirr fəzilətin,
Məktəb ki, dar sihhətidir xəstə dillərin,
Məktəbdədir əlacı bəlayi cəhalətin.

XXX

Məktəb ki, hər umur muhummun kilididir,
Məktəbdədir gülayişi əbvab dövlətin,
Məktəb ki, din cəmalinə zivər fəzayidir,
Məktəbdədir nümayişi hüsn dəyanətin.

XXX

Nakam, kim ki, talib isə dürr hikmətə
Məktəbdədir xəzinəsi ol dürr hikmətin .

Nakam sxolastikadan uzaq olan təbii elmlərin xeyrinin təbliği ilə kifayətlənməyib "Gəncineyi ədəb" (Ədəb xəzinəsi) divanındakı 31 şeir-məqalə ilə gənclərdə saf eşq-məhəbbət, vətənpərvərlik, xeyirxahlıq, düzlük tərbiyə etməyə çalışmışdır.

Nakam 1905-ci ildə Şəkidə vəfat etmişdir.

Əsərlərindən nümunələr:

## Qəzəllər

1. Keçirdim aləmi-hiyrətdə, ey dil,
Keçirdin ömrünü qəflətdə, ey dil.
XXX
Görüb bu aləmi-adəmfəribi
Unutdun əhdi bir reyətdə, ey dil,
XXX
Fəraqət hasil et, tərki-səva qıl,
Yetər ah etdiyin möhnətdə, ey dil,
XXX
İrşidi aşiqan yeksər vüsalə,
Həmin sənsən qalan firqətdə, ey dil.
XXX
Mürcərrəd ol, mücərrəd ol da, gör də
Nələr var guşeyi vəhdətdə, ey dil,
XXX
Həzaran dərdi-ruhazar çəkdin,
Yenə töhmətdəsən, töhmətdə, ey dil,
XXX
Olub Nakama dil Nakam oldum,
Yıxıldım atəşi-həsrətdə, ey dil.

2. Fəğan ki, künhi-qəmi-can bilinmədi, qaldı,
Təvəqqeyi dili-nalan bilinmədi, qald.
XXX
Simati-dəhrdə hər kəs nəsibini buldu,
Nəsimi-zümreyi-rindan bilinmədi, qaldı.
XXX





Cəfayi-firqəti-canal bilindi muybəmu,
Səfayi-vəsl kəmakan bilinmədi, qaldı.
XXX
Cahanda hər mərəzə bir əlac olub peyda,
Fəraq dərdinə dərman bilinmədi, qaldı.
XXX
Kitabi-eşqdə dərki-üqul əcz bulub,
Həzar nükteyi-pünhan bilinmədi, qaldı.
XXX
Bilindi qüsseyi aləm səbahi həşr oldu,
Hekayəti-şəbi-hicran bilinmədi, qaldı.
XXX
Kimin əsiri, kimin namuradıyam, Nakam,
Nədir bu etdiyim əfqan bilinmədi, qaldı.

3. Cami-səfada qalmayıb artıq əsər-məsər,
Mirati-dildə qət-qət olubdur kədər-mədər.
XXX
Mümkünsə də iqqamət əkər kuyi-yardə,
Mümkün deyil bu büqədən, ey dil, səfər-məfər.
XXX
Təzvirdir, təribdir axır nəticəsi,
Hər bir kəlamın olsa, məalı əkər-məkər.
XXX
Getmiş qərar təndə Sükeymani-ruhdai
Yoxdur hənduz hüdhudi-dildən xəbər-məbər.
XXX
Məcnun kimi kənar olub adəbi-eşqdən
Bər Leyli vəş cəmalına qılmam nəzər-məzər.

XXX

Mən aşiqəm o şahidə kim, çıxsa pərdədən,
Nabud olur süehrdə xur-mur/qəmər-məmər.

XXX

Nakam, yandın atəşi-möhnətdə, bə-d əzim
Yaxmaz səni cəhmü səqər-məqər.

**Söz haqqında**

Demə ki, bu təhfeyi-şayan deyil,
Qabili-dərgahi-kamran deyil.
Olsa da hər naciz əkər,
Payi-mələkdən ki, deyil duntər-
Kim, bu sərana süxəni-nəczidir,
Cümlə səva şiridir, o, məczidir.
Tənk deyildir süxən əndazəsi,
Aləmi tutmuş süxən avazəsi.
Bəhri-məanidə süxən nuhdur,
Cümlə səva cism, süxən ruhdur.
Çıxmasını zahirə gənci-nihan.
Qıldı iradə çu xudayi-cahan.
"Kaf olub ol gənci-nihandan burun,
Çıxdı həm ol Kafi ilə bürunə nun".
Bu iki hərf ilə avaz olub.
Xilqətin oldu səbəbi əmri-"kən",
Yəni əzəl gəldi vücuda süxən,
Aləmi-xilqətdə nə kim, vardır,
Cümlə ol əmr ilə pədidarıdır.





Gövhəri-dərayi-nihandır süxən,
Cövhəri-gəncineyi-candır süxən.
Kim, süxəni vəsf edə əhli-fünun.
Olmazsa kər vəsf süxənlə süxən,
Vəsf edə bilməz süxəni əhli-fən.
Tabaqiyəm olsa süxən vəsf əgər,
Aciz olur nüktəvaran müxtəsər.
Cümlə süxən vəsfin edənlər rəqəm,
Metarif olmuş buna kim lacəram.
Bülbüli-gülzari-bəyandır süxən,
Qasidi-dil, peyki-rəvandır süxən.
Olmasa aləmdə süxəndən mədəd,
Məsələ puşidə qalıb ta əbəd,
Aləm ara cümleyi-mafassüdür,
Gənci-xamuşandan etməz zuhur.
Ey süxəni-işvəkərü dilruba,
Dil bulur ancaq sənin ilə səfa.
Nayil olan yoxsa da didarına,
Cümlə giriftardır asarına,
Oldu vicudunla cahan paydar,
Buldu rəvan təndə səninlə qərar.
Söyləmə artıq dəxi, Nakam, sən-
Kim, rahi-rəftarda sənxamsan.
Olma süxən vəsfin edib şərmsər.
Sən süxəni qıl süxənə vaküzar.
Baqa nəva saz edib, avaz qıl,
Mətləbi şərh etməyə acaz qıl.

## Füzuliyə nəzirə

Kuyi-inkarə duş gedib eylədim buka,
Kuş eyləyib fəğanımı ol türki-dilrüba,
Dərdimi bildi, heyrətimi gördü cabəca,
Rəhm etdi halıma dedi-ey ərseyi-bəla,
Kim eyləmiş bu dərdə səni mübtəla, dedim:
Mən bilməm özgə, aşiqi-heyranınam sənin.
Ol sərvqəd eylər ikən kəşt gülşəni,
Fərqi bulmuş idi məqdəminə aşiqan təni,
Xak üzrə sayəvar görüb nagahan məni.
Xəm qəddimə baxıb dedi: -ey piri-münhəni,
Qəddi-xəmin bu gunə nədəndir dutaı. Dedim:
Həmmali-bari-məhnəti-hicranınam sənin.

XXX

Əfzun olub fərağ qəmi, səbir olub mərhal,
Canu tənimi edib fədayi-vüsal,
Getdim minayi-kuyinə, ol mahi bizaval,
Qeydi-bəlada gördü məni, eylədi sual:
-Kimdir bu bəstə, kimə gəlibdir fəda, Dedim:
-Kuyində vəbih qıl məni, qurbanınam sənin.

XXX

Dildə fərağ atəşi etdikcə ittidad,
Dil eyləyib bükayə təbai-ruz içtihad,
Çeşmim (fəraq) yeritdi aləm ara əşki-xunzad,
Axır görüb bükamı dedi ol pərinişad:
Bəhch nədir bu rütbə edərsən buka? Dedim:
Dilrişi-nişi-nəvaki-müjkanınam sənin.

XXX





Şiddət bulub gönüldə təəmşüq əsərləri,
Çevrəmdə hüyü hay ilə ətfal ləşkəri,
Çəkdi hərimi-yarə məni eşq rəhbəri,
Əhvalımı xərab görüb dedi ol pəri:
-Divanəsən, nəsən, nə olubdur sənə? Dedim:
- Məftuni-çeşmi-fəttatınam sənin.

XXX

Əfşan edib səlasimin ol şahi-şahidan,
Qıldı nəzarə canibi-üşşaqə bir zaman,
Zənciri-mənəvidə məni gördü nagəhan,
Xəndan sual edib dedi: -ey aşiqi novan,
Söylə nədir bu silsilədə macəra? Dedim:
Dilbəcteyi-səlasim-əfşanınam sənin.

XXX

Oldum təriş eşqdə Nakami-namdar,
Nakamlıqda aləm ara buldum iştihar,
Nakam olduğum olub axır yəqini-yar,
Bir gün edib hüzur dedi ol mələküzar:
-Nakamsan nə vaxtdan, ey binəva? Dedim:
-Ta kamuçiyyi-vəsalət-pünhanınam sənin.

## Həqiqi eşq-məhəbbət haqqında

Xah həqiqi ola eşqin sənin
Xah məcazi ola eşqin sənin,
Hansı birində olasan eşqbaz,
Sabitü sadiq olub, ol sərəfraz.
Qisseyi Sənanı edib dərnəzər,

Eşqdə sənan kimi ol cilvəkar.
Yad qıl anı ki, o piri-dilər
Düxtəri-tərsayə çu oldu əsir,
Eşqə fada qıldı dilu canını,
Eşqdə tərk etmədi canını.
Sabit olub eşqdə ol binəva,
Xahişi-cananəsin etdi rəva.
Bağladı zünnar olub bütpərəst,
Etmədi peymaneyi-eşqi şikəst.
Dərgahi-tərsadə olub xukban,
Oldu xənazirilə ülfətkənan.
Beylə rəzalətləri qıldı qəbul,
Etmədi adabi-vəfadan nükul.
Oldu rəhi-həqqi bulub yaqibət
Sədrinişini-hərəmi-mərifət.
İndi bu pəndimdən olub hissəmənd,
Zümreyi-üşaqda ol sərbülənd.
Səndə olub eşqdə sabitqədəm,
Mətləbi-dilxahını bul sən də həm.
Qeyrət edib aşiqi yekrəng ol,
Yar ilə həmbəzmü həmahəng ol,
Şərt deyil aşiqi-russar olub,
Bəsteyi-dil zülfi-siyəhkar olub,
Nalə qılıb, eyləyib ahu buka,
Didələrin qan təkə sübhü məsa.
Xas deyil eşqi-ruxi-dilbərə-
Kim olub aşiq buti-məhpeykərə.
Vəsldə hər dəm olub əndərtələb,
Hicrdə nalan olasan ruzu şəb.





XXX

Eyləyib əsnami-məcazi şikəst
Məqsədin olmağa həqiqətpərəst
Səltənəti-fəqrdə sər pic qıl,
Mülki-Süleymanı keçib hiç qıl.
Ey dili şuridə, bəhəqqi-xuda,
Rahi-həqi bulmağa bir himmət et,
Vasili-həqq olmağına qeyrət et.
Bülbül edər nalə xüda eşqinə,
Sən dəxi gəl hələ xuda eşqinə.
Əbr kiryə haman şövq ilə,
Qönçə qılır xəndə haman zövq ilə.
Olmasa hər dildə əgər eşq, bil,
Təməsidir kürbənin ol, dil deyil.
Eşq deyil siyrəti abu kimin,
Eşq isə ancaq sifətidir dilin.
Can təni-adəmdə edən dəm qərar,
Niştəri-eşq ilə olub zəxmdar.
Ataşəsər bir neçə qətrati-xun
Çıxdı haman zəxmdən, oldu bürun.
Bildilər ol halətin əncamını,
Qoydular ol qətrəyə "dil" namını.
Olmasa dil aşiqi-məhnətzədə
Parçeyi-ləhmdir afətzadə.
Ləhmliyi tərk qılıb, gəl dil ol,
Elmü ədəb eşqinə sərmənzil ol.

XXX

Eşq deyildir kim, olub bütpərəst,
Daim olub cami-qurur ilə məst,

Etməyəsən fəhm ki, dünya nədir,
Bilməyəsən, aləmiüqba nədir,
Yenə xətada olasan hər zərov,
Meykədələrdə ola başın girov.
Eşq odur kim, ədabamuz ola
Aqibəti xürrəmüfiruz ola.
Olsa əgər eşq həqiqətnüma,
Aşiq olar peyrəvi-əhli-vəfa.
Aşiq olan xaki-təbiət olur,
Eşq sərana ədəbü elmdir,
Eşq, demək, məskənəti-helmdir.
Aşiqin əxlaqi-mühəzzəb gərək,
Aşiq olan pakümüəddəb gərək,
Kim, ədəb ilə bulur əhli-vəfa,
Kişvəri-ürfanda taği-səfa.
Elmü ədəbdən xəbəri olmiyən
Bəhrəvər olmaz əsəri dindən.
Cümleyi-ədyanda əsasi-mətin,
Elmü ədəb olmuşunu bil yəqin
Şəri mübin daxi ədəbdir əyan,
Yəqin ki, din isə ədəbdir həmən.
Adəmdə kəşf oldu ədəb aləmi,
Feyzi-ədəb qıldı əziz adəmi.
Oldu çu iblis ədəbdən kənar,
Randeyi-dərgah olunub, oldu xar.
Olma cuda, ey gönül əbrardan,
Sən də götür hissə bu kəfdardən,
Bil ki, ədəb icrə təcəlla nədir,
Sudi nədir, ondakı məna nədir,





Dövləti-pürsud ədəbdir, ədəb,
Himmədi-məsudi-xirəddir ədəb,
Bari-əmanət bu ədəbdir haman-
Kim, çəkir ancaq onu insan olan,
Məhv ədəbdir ədəbin hasili,
İzzəti-dareyni bulur vasili.
Yəni ədəb sahibi huşiyar olub,
Cümleyi-üzv ilə ədəbkar olub,
Verdiyi peymanın etsə vəfa,
Bəndəliyi həqqını qılsa əda,
Adamiyyət silkinə daxil olur,
Rüşd bulur, mərdumi şamil olur.
Meyl qılıb həqqə cənabi-xəlil,
Olduğunçün aşiqi-rəbbi-cəlil,
Narı məqərr etməyi qıldı qəbul.
Eyləmədi rəsmi-ədəbdən nükul.
Hifz qılıb kəndi xuda dustin,
Etmədi ağrayə fəda dustin.
Lütf qılıb eylədi ehsan ona,
Qıldı həman narı gülüstan ona.
Sən dəxi qal sidə ilə, Nakam nuş
Meykədeyi-eşqdə bir cami-nuş.
Eşqdən, adabdan agah olub,
Sakdilü arifi-billah olub,
Əvvəl edib pəndinə kəndin əməl,
Sonra çıxıb ərseyi-təbliğə gəl,
Söylə ədəb nolduğunu, qıl bəyan,
Kim, bilib, əhlü-ədəb olsun cahan.

## MOLLA YÜSİF RACİ

XVIII əsrin birinci yarısında Şəki mahalının Şabalıd kəndində anadan olmuşdur. Nəbi, Süleyman və Zarenin müasiridir. Onlarla birlikdə Məhəmməd Hüseyn xan Müştaqın saray şeir məclisinin fəal üzvü və xanın ehtiram bəslədiyi dostlarından biri olmuşdur. Şeirlərindən aydın olur ki, o xanla sirdaş olmuş və bütün dərdlərini xana söyləyib ondan kömək istəmişdir. Şeirləri dil sadəliyinə və lirikliyinə görə Zare və Müştaqın şeirlərindən fərqlənir. Onun lirik şeirləri zəmanədən və sevgidən şikayətlə doludur. Bu cəhətdən "Olsun", "Məndən" və "Xana" müraciət şeirləri səciyyəlidir.

Məhəmməd Hüseyn xan Müştaq öldürülənədək Şəki şəhərində yaşamış və XVIII əsrin sonlarında vəfat etmişdir.

Şeirlərindən nümunələr:

### Olsun

Məni yardan ayrı salan
Görüm üzün siyah olsun
Dərdə düşüb mənim kimi
İşin hər gündə ah olsun.
XXX
Əlif qəddin dönə yayə,
Hər işlərin gedə zayə,
Cahanda tapma sərmayə,
Ömrün, günün gümah olsun.





XXX
Diri ömründə kəm alma,
Xəlayiq içrə nam alma,
Hərgiz məqsəd, məram alma,
Yaxşı halın mibah olsun.
XXX
Zəlil ol sən ki, mən xaram,
Kimim var, kimə yalvarım,
Sənə hər gündə qarğayım,
İstər mənə günah olsun.
XXX
Döndərdin yaşimi çayə,
Düşəsən sən də ah vayə,
Qisasın, əlbəttə, fəryadə,
Qalmaz, beylə agah olsun.
XXX
Beyt Əlhüzn məskənimdir,
Kim bu işdə düşmənimdir,
Viranələr malı mənimdir,
Ona düşmən Allah olsun.
XXX
Raci bu gün yardan oldi,
Keçdi namu, ardan oldu,
Mal və mülk, vardan oldu,
Manelәri kəmrah olsun.

## Məndən

Əli Əkbər xidmətinə
Salam olsun rəvan məndən.
Baxma rəqibin sözünə
Çox deyərlər yaman məndən.
XXX
Məni yarə vüsul eylə,
İstər qapında qul eylə,
Öp al ələ, qəbul eylə,
Gəlsə, kağız, nihan məndən
XXX
Murad şəmimi söndürmə,
Məni məhruma göndərmə,
Gülbaşınçın üz döndərmə,
Amandır əlaman məndən.
XXX
Əli sənə edə yardim,
Artırma qüsseyi dərdim,
Çəkər olsam ah sərdim,
Yanar cümlə cahan məndən.
XXX
Yarə qılma rəqib yari,
Mürəxəs qıl məni bari,
Özün insaf eylə bari,
Artıqmı Mirzəxan məndən.
XXX
Həzrət Əli havadarın,
Hüseyn, kərbəla yarın,





Vəfasın gör biqərarın,
Dönübdür bu zaman məndən.
XXX
Yetmiş Racinin dadinə,
Rəhmin gəlsin fəryadinə,
Heç aşiqlər eşq adinə,
Olmaz artıq yanan məndən.

## Xana müraciət

Məni yardan ayırdılar,
Sənə olsun xəbər, canım.
Mənim kimi bu əyyamda,
Kim bu zülmü görər, xanım.
XXX
Həsrət idim mən al gülə,
Cəfalar qaldı bülbülə,
Sitarəm düşdü sünbülə
Kim bu zülmü çəkər xanım.
XXX
Bu gün əldən yarım getdi,
Namus ilə arım getdi,
Noh əflakə zarım getdi,
Qıl ahımdan həzər xanım.
XXX
Yarı qıldın bu gün məndən,
Dolannam ol səbəb gendən,
Küsübdür bu qulun səndən,
Uman yerdən küsər, xanım.
XXX

İşim gəldi yaman oldu,
Gözüm yaşı rəvan oldu,
Dərdlər canda nəhan oldu,
Həsrət qəddim bükər, xanım.

XXX

Sən qılıbsan aşığı zar,
Ey olan aləmə sərdar,
Gecə-gündüz yanar, ağlar,
Qanlı yaşım tökər, xanım.

XXX

Məni qoyma bu giryanda,
Qalmışam xeyli dərmanda,
O kəlləgöz Mirzəxanda,
Görübsən nə hünər, xanım.

XXX

Ərzim budur o dövlətə,
Hökm eyləyə, görə, yetə,
Kim görübdür bir övrətə,
Dünyada iki ər, xanım.

XXX

Götürmədim gülün xarın,
Unutdum eşq bimarın,
Güclü gücsüzlərin yarın,
Alır məgər əldən xanım.

XXX

Abdaltək gəlmişəm şali,
Olmuşam hicr pamalı,
Qılsınlar dərdimə hali,
Vəzirlər, mirzələr, xanım.





XXX

Sonalar keçməz gönüldən,
Bülbül ayrılmaz gülündən,
Mən dönməzəm yar yolundan,
Sağ olduqca bu sər, xanım.

XXX

İqbal döndü, bəxtim yatdı,
Görün fələk nə şər satdı,
Aldı əqlimi, aldatdı,
Belimdə zər kəmər, xanım.

XXX

Çeşmim əskin tökə qaldı,
Qəddim-qəddim bükə qaldı,
Zari həsrət çəkə qaldı,
O, bal ləbdən əmər, xanım.

## KƏRİM AĞA ŞƏKİXANOV – FATEH

Kərim ağa Fateh XVIII əsrin sonlarında Şəki şəhərində Hacı Çələbi xanın nəslindən olan Şəkixanovlar ailəsində anadan olmuşdur. Atası Şəki xanlığının son xanı olan Fətəli xandır .

Fateh atası Fətəli xanın sarayında xüsusi təhsil alaraq, ərəb və fars dillərinə mükəmməl yiyələnmişdir. Buna görə də əldə olan qəzəllərindən yalnız ikisi Azərbaycan dilində yazılmışdır. Bu qəzəllərdə də çoxlu ərəb və fars sözləri və tərkibləri işlədilərək, şeir dilini ağırlaşdırmışdır. Ancaq bu qəzəllərdən məlum olur ki, o yüksək ilhamlı, orijinal üsluba malik, qüvvətli bir alim-şair olmuşdur.

Fateh olduqca səxavətli, dövrünün tərəqqipərvər şəxslərinə və ziyalılara hörmət bəsləyən, onlarla yaxın dostluq edən bir şəxsiyyət idi. Atasının sağlığında sarayda, xanlığın süqutundan sonra isə şəxsi evində qurduğu məclisləri dostlarsız və ziyalılarsız keçməmişdir. Onun məclisləri tərəqqipərvər adamların da ülfət yeri hesab edilirdi. O, bu adamlara xüsusi ehtiram göstərirdi. Bu dostlardan ən çox hörmət bəslədiyi Mirzə Fətəli Axundov idi. O, M.F.Axundova Şəkidən tez-tez qiymətli töhfələr və sovqat göndərər və onu ziyarət etmək üçün Tiflisə gedərmiş. Təsadüfi deyil ki, Mirzə Fətəlinin atalığı Axund hacı Ələsgərin vəsiyyətinə əsasən onun ölümündən sonra qızı Tubi xanımı Tiflisə aparıb Mirzə Fətəli ilə evləndirən, onlara toy məclisi düzəldən də Kərim ağa Fateh olmuşdur.





Fateh bir alim kimi də məşhurdur. Belə ki, "Şəki xanlığının tarixi" adlı çox qiymətli bir əsərin müəllifidir. Fateh 1854-cü ildə vəfat etmişdir.

## MOLLA QASIM ZAKİR

XVIII əsrin sonları XIX əsrin əvvəllərində Şəkidə yetişən şairlərdən biri də Molla Qasım Zakirdir. Onun doğulduğu tarix dəqiq məlum deyildir. Ancaq, Qasım bəy Zakirin müasiri olmaqla onun şeirləri səpgisində çoxlu qəzəl, müxəmməs və rübailər yazmasından və Kərim ağa Fatehin müasiri və yaxın dostu olmasından məlum olur ki, Molla Qasım Zakir, əsrın sonlarında Şəkidə anadan olmuşdur.

Təlim-tərbiyəsini atası Muraddan alaraq ərəb və fars dillərində mükəmməl bilik sahibi olmuşdur. O, məktəbdarlıq etmək və barama qurdu bəsləməklə ailəsini dolandırmışdır.

Geniş mütaliə onda şeir və sənətə xüsusi həvəs və məhəbbət yaratmışdır. Onun saxavətli dostu və müasiri alim-şair Kərim ağa Fatehə yazdığı şeirdən məlum olur ki, o fəqir həyat keçirdiyi üçün Fatehdən maddi və mənəvi yardım etməsini xahiş edir.

Digər tərəfdən isə məlum olur ki, Kərim ağa Fateh kasıblara kömək əli uzadıb, onları çətinliklərdən xilas edən bir şəxsiyyət olmuşdur:

"Ağa, bu gülşəni aləmdə bəndə xar qalsınmı?
Deyim dərgahına bir ərzi-halım var,
qalsınmı?
Özün insaf elə, gönlümdə ötən atəş bar
qalsınmı?
Sənin tək mərd ağası olan naçar, qalsınmı?
"Gəl etmə məni qəmü-hicrə giriftar,





Sənsiz çəkirəm ahi-ciyər süzi-şərabar,
Öldürmə məni, hicrilə şuxi-sitəmkar
Əlqüssə mənəm, Zakiri dili xəsteyi bimar".

Molla Qasım Zakirin istedadlı və gözəl şeirləri təkcə Şəkidə deyil, Şirvan və Qarabağ şairlərinin də rəğbətini qazanmışdır.

Zakir XIX əsrin ortalarında Şəkidə vəfat etmişdir.

Şeirlərindən nümunələr:

### Cığalı müxəmməs
(Şəkili Süleymana nəzirə)

Əğyari gəl ey dost, kənar et, səni tari,
Bir rəsmi pisəndidə şüar et, səni tari,
Bir yanım lütf eylə, güzar et, səni tari,
Bir ləhzə kənarimdə qərar et, səni tari.
Dil xəstə fikarəm,
Bi munis vüzarəm,
Bir səb və qərarəm,
Mən aşiq zarəm.
Fikri dil bu aşiqi zar et, səni tari.

XXX

Hər kəsi bilmə özünə aşiq sadiq,
Həmcins gərəkdir həmcinsə ola münaqib,
Nacins ilə söhbət sənə nəlayiq.

Sən bir bət ziba,
Sən bir gül rəna,
Məşuq dil ara,
Yoxdur sənə həmta.
Bir rəsmi pəsəndidə şüar et, səni tari.

XXX

Ey nuşi mey və mehri vəfa cam səfadən,
Gəl ülfətini kəsmə gələn əhli vəfadan,
Guş et sözümə, çək əngi cövr və cəfadan,
Əndişə qıl, ey tac sərim qəhr xüdadən.
Sərvlərə sərvər,
Bir lütfünü göstər,
Bəsdir bu cəfalər
Bir yanimə lütf eylə, güzar et, səni tari.

XXX

Yüz xanə zərin ola sənsiz nə səfası,
Yüz mənzil mişkin ola sənsiz nə səfası,
Yüz qönçeyi rəngin ola, sənsiz nə səfası,
Yüz bəzm xoş ayin ola sənsiz nə səfası.
Ey zinəti aləm,
Ey xülqi mükərrəm,
Ey şahi mübəzzəm,
Fəryadki bir dəm.
Bir ləhzə kənarimdə qərar et, səni tari.





XXX

Gəl etmə məni dərd və qəm hicrə giriftar,
Sənsiz çəkərəm ah cigər suz şərərbar,
Öldürmə məni hicrilə, ey şux sitəmkar,
Əlqissə mənəm Zakir dil xəstə, bimar
Ey Nadiri dövran,
Qıl dərdimə dərman,
Mən bəndeyi fərman,
Gəl-gəl sənə qurban,
Fikri dil bu aşiqi zar et, səni tari.

**Xoruz**

Yatardın ağacda şad bipərva,
Nə gəldi düşdün bəlayə, xoruz,
Beylə süallından eylə əstəfrürllah,
Haşa sual olmaz qəzayə xoruz.
XXX
Hər əşya ki, müsahib qüvvət olur,
Min yaşasan axır, bir gün fövt olur,
Gül nəfəs zayiqəm ələmuş olur,
Ümid yoxdur bu gündən fəryadə xoruz.
XXX
Tavus cilvəli, gülgünə libas,
Bu gününə heç etmədin sən qiyas,
Deyirdin ayılın ya əyyühənnas,
Yetirdi fəryadın səmayə, xoruz.

XXX

Səndən əzəl keçən şah müəzzəm,
Neçə padşahlar Cəmşid ilə cəm,
Olari də sənintək, bu tiö sitəm,
Calladüş verdi cəfayə, xoruz.

XXX

Əgər eşitmiş olursan təskin,
İzacati əcəlhəm ayəsin,
Zakirtək qəlbini dut müdməyin,
Gedərsən cənnət-əl məvayə, xoruz.

## Olmaz

"Gələndə zühurə nur təcəlla,
Camalıntək münəvvər olmaz,
Gərdun hikmətdən çıxan aftab,
Zərrəcə sənə bərabər olmaz.

XXX

Məhrumə fələkdə varisə hər çənd,
Zinət ruxsarın olarlar bihəd,
Səfheyi ruyində xal zəbərcəd,
Hər bəni adəmə müyəssər olmaz.

XXX

Kəmahi hüsnünə yetmədi idrak,
Afət çeşmindən oldum xofənak,
Ey gözəl cəlladım şah qəzəbnak,
Sən kimi Zakirə sitəmkar olmaz.





## Gəlin

Saldı ol qönçə dəhanın məni sevdayə gəlin,
Necə ki gül yanağın bülbülü qovğayə, gəlin,
Gördü göz, düşdi canım ah ilə yüz vayə, gəlin,
Məcnun oldum düşübən vadiyi səhrayə, gəlin,
Nə gəlin və nə gəlin, zinət və zibayə gəlin.

XXX

Xoş gülüş, xoş danışıqdər, məzəli cümlə sözi,
Xuyi xoş, xisləti xoş, mah münəvvər yüzi,
Üzülür, can üzülür, gər süzülür alma gözi,
Məzəli, çox məzəli, qəmzəli qayətdə özi,
Ağ yüzi, gül yanağı, lalə həmrayə, gəlin.

XXX

Saç uzun, gərdən uzun, qamətidir sərvirəvan,
Qaş qara, göz piyala, dişləridir püstə dəhan,
Şuxyanaq, ləli dodaq, ləhcəsi də canlar alan,
Sinə meydan, məmsi cübbə, gözəl, incə miyan,
Dolu bud, canlı totuq, sərbəsər ağ mayə gəlin.

XXX

Qırmızı yaylıq, əlində gül dəsmal ləçəyi,
Sari köynək geyinib, cümlə midaxil ətəyi,
Nimtənə xalis, zibayi müzəyyən bəzəyi,
Zərbalax dizlik, ayağında bənövşə çiçəyi,
Sağri başmaq, corabi xəmsə geyib payə gəlin.

XXX

İki püstani arasında həmayil asılıb,
Yəni fincan göbək üstə qızıl gül asılıb,
Düzülüb yaxasinə, qızıl yaxalıq kəsilib,

Qolda qolbağı, ətəyində ətəklik, asılıb,
Mərhabələr bu qədər surət və simayə, gəlin.
XXX
Nagihan gördi gözim, çıxdı müəllayə, gəlun,
Dedim ey qönçədəhan bircə yavaş get mən ölüm,
Dərdim artıxdi dəyan, bir danışaq ağrım alim,
Yıxılım payinə mən, dərdimi bu canə salım,
Durubən sər kimi başıma sal sayə, gəlin.
XXX
Ağı ağ, qırmızəsə lami əhmər kimidir,
Buti ağ, əndamı ağ, sinəsi mərmər kimidir,
Çəkilib qəddi onun sər və sənübər kimidir,
Məmələr şəhd şəkər qənd mükərrər kimidir,
Gəldi cənnət pərisi sən kimi obayə, gəlin.
XXX
Mənə bir şah cahan, rəhm eylə qurbanın olum,
Ölürəm, ölməkimi fəhm eylə, qurbanın olum,
Dutaram daməngi zəhm eylə, qurbanın olum,
Vermə gəl tari üçün Zakiri rüsvayə, gəlin.





**Məndən**

Başına döndüyüm, a nazlı dilbər,
Gəlirmi güşinə sədalar məndən,
Beylə bəd zəmmanə, hiyleyi əğyar,
Qorxuram səni də yad eylər məndən.
XXX
Səndən qeyri aşiqin bir mədari yox,
Can çıxıb, cəsədin ixtiyari yox,
Qərq oldim dəryayə heç kənari yox,
Xof eylər görəndə adalar məndən.
XXX
Mən Zakirəm tərsa sevdim halimi,
Fələk əyib mənim qəddi qalimi,
Bəs mən kimə qılım ərz halimi,
Küsübdür o mələkzadələr məndən.

**Vardır**

Çox-çox gül demə ey bülbüli şeyda,
Bir gül üzlü yarım mənim də vardır,
Dünyavü-mafiha gülməz eynim,
Gözləri xumarım mənim də vardır.
XXX
Ol afəti dövran, şuri zəmanə,
Zülfi-siyahına çəkəndə şanə,
Sənan kimi rəxnə düşər imanə,
Hakimi zünnarım mənim də vardır.

XXX

Ağ buxağı təri-tazə nəstərən,
İşvə ilən nazü-qəmzə göstərən,
Hər baxışı yüz min aşiq öldürən,
Şux sistəmkarım mənim də vardır.

XXX

Ərzim budur sənə, ustadi-kamil,
Gülşəndə gər olsa yüz min ənadil,
Biri ola bilməz mənə müqabil,
Çox tuti keftarım mənim də vardır.

XXX

Hər zaman ki, meh qönçəni çak elər,
Əndəlibin gönlün fərəhnak elər,
Zakiri lütf ilə bir zəhhak eylər,
Telləri şahmarım mənim də vardır.

XXX

Badi-səba mənim ərzi halımı,
Gedən olsan o canana deyərsən,
Bu gönül şəhrinin bərbad olduğun,
O zülfləri pərişanə deyərsən.





## MOLLA ƏHMƏD ƏFƏNDİ - ZÖVQİ

Zövqi XVIII əsrin sonlarında Şəki xanlığının Baş Köynük kəndində anadan olub və o kənddə yaşayıb yaratmışdır. Biliyi, xeyırxahlığı və gözəl lirik şeirləri sayəsində böyük hörmət və nüfuz qazandığı üçün xalq onu kəndə qazi seçmiş və ömrü boyu bu vəzifədə qalmışdır. Təkcə Şəki xanlığı əhalisi deyil, Azərbaycanın bir çox alim və şairlərinin də hörmətini qazanmışdır.

Abbasqulu ağa Bakıxanov Qüdsi, Kərim ağa Fateh, M.F.Axundov ona böyük ehtiram göstərərək, onunla dostluq etmişlər.

Zövqi dövrünün elmləri ilə silahlandığı, mütərəqqi və xeyirxah əməllər sahibi olduğu üçün öz dövründə Azərbaycanən ən dəyərli ziyalısı sayılırdı. Onun böyük nüfuz qazanmasının nəticəsidir ki, onun sonrakı nəsilləri bu günə kimi "Qaziyevlər" familiyası daşımışlar.

Zövqi əsas etibari ilə lirik şair olmuşdur. Lakin onun lirik şeirləri təkcə məhəbbət tərənnüm etməklə qalmır. O bu şeirlərdə bir gözəlin tərifi ilə kifayətlənməyib, insanın bütün varlıqlardan gözəl və qiymətli olduğunu da tərənnüm edir. Onun üçün insan gözəlliyi huri qılman, mələk gözəlliyindən yüksəkdə durur və olduqca qiymətlidir. Zövqi şeirlərində malı, dövləti, şöhrəti, zinəti, insan əxlaqı, insan gözəlliyi və insanın saf məhəbbəti qarşısında sönük və qiymətsiz hesab edir. Onun üçün ilahi gözəllik deyil, hərtərəfli təbii gözəllik qiymətlidir. O bu dünyanın gözəlliyini yüz cənnət gözəlliyindən üstün tutur. Bu cəhətdən

onun "Gönlüm səni istər" şeiri olduqca xarakterikdir. Bunu şeirdən verdiyimiz bir bəndlə də isbat edə bilərik:

"Yüz zümreyi-ərbab gər məkan ola mövcud,
gönlüm səni istər.
Yüz bəzminə zişərəfi-şan ola mövcud,
gönlüm səni istər.

Zövqi 1865-ci ildə doğulduğu və yaşayıb yaratdığı Baş köynük kəndində vəfat etmişdir.

Şeirlərindən nümunələr:

"Yüz zümreyi-ərbab gər məkan ola mövcud,
gönlüm səni istər.
Yüz bəzminə zişərəfi-şan ola mövcud,
gönlüm səni istər.
Yüz hüsnü mələk tək özü insan ola mövcud,
gönlüm səni istər.
Yüz ləli-cəvahirdir qəltan ola mövcud,
gönlüm səni istər.
Yüz məqsədi-gönlüm mənə asdan ola mövcud,
gönlüm səni istər.

XXX

Yüz rahət, yüz izzət, yüz izzəti-əşhər
gər olsa müqəddər,
Yüz bəzmi-mülazimləri, yüz huri-səmənbər
ləli-ləbi şəkkər.





Yüz məclisi-məftuş ola ta sübh sərasər
pur zinətü zivər.
Yüz məhvil ola zinəti-diban-mücəvvər
yüz saqiyi-gövsər.
Yüz rahəti-canım mənə hər yan ola mövcud
gönlüm səni istər.

XXX

Yüz həmrahi-gül çöhreyi-gülgünəyi kafam
olsa mənə həmdəm,
Yüz şahidi-şirin-ləb, yüz sərvi-dilaram
yüz ruhi-mücəssəm,
Yüz tutiyi-şəkkəri-şikən ləbləri badam
hər vəqtdə görsəm,
Yüz döktəri-zərəfşan, yüz dilbəri xaşnam
qılsa məni xürrəm,
Yüz dərdimə, yüz tövrdə dərman ola mövcud
gönlüm səni istər.

XXX

Yüz bülbül ola, yüz gülü yüz gülşənü gülzar
yüz ləli şəkər bir,
Yüz süsən, yüz yasəməni-bülbüli-əttar
yüz nuri pürənvar,
Yüz simi-zəşən, qönçə dəhən, ayineyi-ruxsar,
xoş şiveyi-ətvar,
Yüz dilbəri-tənnaz ola üşaqə xiridar,

yüz yari-vəfadar,
Yüz Mehri-münəvvər məhtaban ola mövcud
gönlüm səni istər.

XXX

Yüz cənnət ola cövhi dolu huriyi-qılman
ləli-ləbi xəndan,
Yüz məhliqə qaşı ilə gözləri məstan
inculəri qəltan,
Yüz məhvəş ola gül üzünə zülfi-pərişan
həm telləri əfşan,
Yüz dilbəri ola mah kimi Zövqi sənə qurban
yüz Yusifi-Kənan,
Yüz gülşən, yüz sərv xuraman ola mövcud
gönlüm səni istər.
Yüz simi- bədən, incə iyan, gözləri məstan,
Yüz dilbər ola hüri-liqa, nazikü cəzban,
Yüz xali həbəş, gərdəni mina, xətti rəyah,
Yüz sinəsi mərmər, dişi dür, afəti dövran,
Yüz bakirə düxtər ola, gönlüm səni istər.

XXX

Yüz şahidi-çirazü, hələb, Misri, Səmərqənd,
Yüz zinəti-aləm, fərəh əfza şəni fərxənd,
Yüz şəmi-diləfruz ola, yüz ləli şəkər-qənd,
Yüz mən kimi biçarə Kərim hüsnünə həsbənd,
Cümlə sana sakər ola, gönlüm səni istər.





XXX

Yüz şux dilaram ola, gönlüm səni istər,
Yüz sim-zər əndam ola, gönlüm səni istər,
Yüz bəzmi-məyü cam ola, gönlüm səni istər,
Yüz kəz büti-xudakam ola gönlüm səni istər,
Yüz məclisi-bayram ola, gönlüm səni istər.

XXX

Yüz işvə ilən can alıcı, gözləri kafər,
Yüz naz edici aşiqinə şüxu sitəmkar,
Yüz püstə dəhan, qəddi dur, ləbləri şəkkər,
Yüz sərvi-şahi, qəddi xuraman, sənübər,
Yüz cilvə xoş iqdam ola, gönlüm səni istər.

XXX

Yüz kafiri-tərsabeçə, qarətkəri iman,
Yüz hüsni qəmər, hər biri bir afəti dövran,
Yüz ləli-ləbi-bəqa, çeşməyi heyvan,
Yüz badekəşi saqiyi, sərməsti-qəzəlxan,
Yüz gərdişi-əyyam ola gönlüm səni istər.

## HACI MAHMUD ƏFƏNDİ – NAFE

Nafe XVIII əsrin sonunda Şəki şəhərinin Dodu hissəsində anadan olub, ömrünün sonuna kimi orada yaşamışdır. Mədrəsə müəllimliyi onun əsas peşəsi olmaqla heç vaxt bu peşədən ayrılmamışdır. Mükəmməl savadı və yaxşı şairlik təbi varmış. Ancaq şeirlərinin əksəriyyəti münacat, qəsidə və mədhiyyələrdən ibarətdir. Şeirlərindən dindarlığı aydınca müşahidə olunur. Təhsili ərəb və fars dillərində aldığı üçün şeirlərində çoxlu ərəb və fars tərkibləri işlətməklə əsərlərinin dilini qəlizləşdirmiş və çətin anlaşan şəkilə salmışdır.

Allaha inam və peyğəmbərə ehtiram bəsləyən şairin şeirlərinin çoxu peyğəmbərin şəninə mədhiyyələr və şəriət qanunlarına rəğbətlə yazılmışdır.

Hacı Mahmud Əfəndi-Nafe özündə olan bu xüsusiyyətlə fəxr edərək, şeirlərinin birində belə yazmışdır:

"Vücudi-vacibi-zatın müqəddəm həm müxxərdir,
Şəhadət kəlməsi daim dilimizə şəhdü şəkkərdir.

Şair 1876-cı ildə vəfat etmişdir. Onun şeirlərinin çox hissəsi bizə çatmamışdır.

Şeirlərindən nümunə.





### Nəti rəsulüllah

Göründü gözümə bir dəm ziyayi-rövzeyi-xəzra,
Ətirati-dilavizi-damağımda şəmi-məfza,
Təkapu eylədi çeşmi-raməd kim, kəhl qəsdində,
Qubari-müşkbarımdan təsəlla qıldı istirxa.
Nəzər qıldım, o sürətdə şuhudul-qəlb əl verdi,
Tənəüm ləzzətin buluq, bihəmdullah, ey mövla,
Ziya bir növ üruc etmiş səmavatın dərunundan,
Məqami-rövzətdən ta zilli-ərşə etmiş istela,
Məlayiklər müniratı görüb ikram edən vaxtda,
Xitabi müstətab endi "Fəsübhanəl-ləzi üsra".
Tərənnüm etməyə miqri-dilim çox cüstucu etdi,
Təhəyyür etmə damənim tutdu ki, nitqim olmadı guya,
Saqın, ey müflis, aldanma, təhidəstəm-deyib uyma.
Cavahir mədənin bulduq fəamənna və əsləmnamə,
Hüzuri-mənəvidə ruyi-sərgərdanlığım oldu.
Nə sürət yerdə qaldı, bilmədim nə sürəti əsla,
Civari-rövzənin sirri-qəribindən nişan bilməz.
Bilir ol kimsə kim, fəhm eylədi"Vəlleyli iza yəğşa",
Hədisin məzhəri "lov kanə min bədi ələt-təcriz"
Sərayi-qüdsiyan ruhaniyan sirrin edər hala.
Ədbsiz olma, əl çək, Nafe əfsafında dəm vurma.
Neçün nəti-şərifi sureyi- "yasinü həm" taha.

## HACI RƏSUL – "RƏSUL"

Hacı Rəsul "Rəsul" 1802-ci ildə Şəki şəhərinin Yuxarıbaş məhəlləsində anadan olmuşdur. Çox zirək olan "Rəsul" az müddət təhsil almağına baxmayaraq, ərəb və fars dillərini öyrənmiş, bir sıra dini kitabları mütaliə etmişdir. Ticarət və çörəkçilik etməklə ailəsinin gündəlik ehtiyacını ödəmişdir. Az müddət məhəllə məscidində mollalıq etmişdir. Çox mütərəqqi və mömin bir şəxs olduğundan əsərlərinin çoxunda dini məsələlərdən bəhs etmişdir. Təhsilini ərəb və fars dilində aldığından şeirlərində ərəb və fars dillərində kəlmə və tərkiblər işlətməklə dili ağırlaşdırmışdır:

"Yetişdim rövzəyə, gördüm binayi-mustafadır bu,
Məqami-sərvəri-din, şafiyi-yövmül-bəqadır bu,
Girib babi-səlamətdən hüzurə əssalam etdin,
Girərkən rövzəsin bildik ki, məhbubi-xüdadır bu"

Hacı Rəsul "Rəsul" hamını daşıdığı əqidə də möhkəm olmağa, əqidəsindən dönməməyə, Allahın əmrini və şəriət qanunlarını yerinə yetirməyə çağıraraq, özünə xitabən yazmışdır:

"Edək həbib/xudanın camalına sələvat,
Şəfiyi-şahid mütləqdi bu günahkara,
Bax onların səbəbi-ictihadi-qeyrətinə,
Qıl inqiyad əsərincə yol açma əğyarə".





Şair bir sıra tərifnamələr də yazmışdır. O, 1882-ci ildə Şəkidə vafat etmişdir.

Şeirlərindən nümunə:

### Dər həqqi–çahar yar

"Lətafət – xülafə ləzzəti çahar yarə
Xülusi-eşq ilə hər kəs edərsə nəzzarə,
Olurdu cövfünə varid hədisi-hikməti-nur,
Çatar bəqayi-səfadə məqami əbrarə,
Cahanda gör nə cəfalar çəkibdi hər birisi,
Nə intiqam ilə xəsmə ediblər çarə.
Üsuli-dində peyapeyümurə qoydu qəffarə,
Bax onların səbəbi-ictihadi-qeyrətinə,
Qıl inqiyad əsərincə yol açma əğyarə.
Ərayidi-xüləfa, həm rəsuli-əmri-xuda
Bərati-bağİ-cinandır, baxın bu əşarə.
Müvəhhidi mütəvəccah edər bu əxbarat.
Rizayi-həqq ilə bir bax bu çərxi-dəvvarə.
Hərarəti-mütəəttəşü mai birrü səfa,
Nə iltizazverir gör qülubi-ənvarə,
Nə feli var isə əbdin qəza günü açılar.
Hüzuri-dərgahi-şahi-qədimü qəhharə.
O gündə, rəbbi, Rəsulun, ricasın eylə qəbul,
Bəhörməti-nəbəvi-rifəti-kərəmkarə.
Edək həbibi-xudanın cəmalına sələvat
Şəfiyi-şahid mütləqdi biz günahkarə".

# MOLLA MƏHƏMMƏD – HÜZNİ

Hüzni XVIII əsrin birinci yarısında Şəki mahalının Aşağı Künküt kəndində anadan olmuşdur. Atası Hacı Əfəndi şair idi. Atasının şairliyi və özünün biliyi sayəsində Şərq klassiklərinin mütaliəsi onda şairliyə həvəs oyatmışdır. Gözəl şairlik təbinə malik olan Hüzni hələ gənc ikən şeir yazmağa başlamışdır.

Şairin əsərləri təbriknamə, tərifnamə, mərsiyə və qəzəllərdən ibarətdir. Bu əsərlər əlyazması halında bir divanda toplanmışdır.

Hüzni bir sıra şeirlərində üləmaların şəriət qanunlarına düzgün əməl etmədiklərindən, müasirlərinin bu qanunlardan uzaqlaşdırıldıqlarına görə intizamsızlaşdıqlarından şikayətlənərək, müsəlmanları düz yola dəvət etmişdir:

"Həqqi təbhid qılıb qani olan mizanə,
Eylər iqdam necə şürü şərü mizanə?
Etsə quranə əgər təaət əhli-quran,
Kafiran rəğbət edib tabe olar quranə.

XXX

Etsə kəftarına girdar güruhi-üləma,
Əmiri- həqdən cühəla bir qədəm olmaz yanə.
Pəhnümə olmasa, həmsayə, xəyanət edəməz,
Kimsəyə rah bulub, cürət edib biganə".





Şeirdən belə məlum olur ki, o saxta din xadimləri olan ruhanilərdən narazı olmaqla onlara kəc baxmışdır. Hüzni dünya malında, var-dövlətdə gözü olmayan bir şair olduğu üçün müasirlərini də bu ruhda tərbiyə olunmağa çağırır. Onun fikrincə dünya malı və mal-dövlətin aqibəti yoxdur, o tükənə və əldən çıxa bilər. Ancaq elm və ədəbiyyat tükənməzdir, daimidir. Elm və ədəb sahibi şərəfə layiq olduğu üçün xalq elmli və ədəbli adamlara hörmət edər. Buna görə də hər kəs elm və ədəb sahibi olmaq üçün səy göstərməlidir:

"Əşrəfül-xəlq olmağa bais bəşər elmü ədəb,
Hadiyi-rahi-riyazi-dadgər elmü ədəb,
İstəsən dünyavü üqba izzü rifət xalq ara,
Eylə hasil, səy edib şamü səhər elmi ədəb.
Malü mənsəb sahibin eylər bəlayə mübtəla,
Sahibin amma bəladan hifz edər elmü ədəb.
Qəm deyil, olmasa dünya dövlətindən dövlətin,
Olsa gər sərmayeyi-əqlü ədəb.
Ehtiram eylər pirü bürnayi-cahan,
Kim ki, olmuşdur ona deyhimi-sər elmü ədəb.
Eylə güşiş, etməyib bir an təcafül, hüzniya,
Rövnəqdir bəzmgahi-xeyrü şər elmü ədəb.

Hüzninin şeirlərində ziddiyyətli cəhətlər də görünməkdədir. Belə ki, şair bir tərəfdən insanları intizama, düz əqidəyə, elm və maarifə, mərifət qazanmağa çağırır, digər

tərəfdən bəşərin şər yuvası olduğun və şərin qadınlar tərəfindən törədildiyini göstərən qadına inamsızlığını təlqin edir:

"Eylə ləhzə həzər bir bəşərin şərrindən,
Kim olubdur sən ilə həmnəfəs "həmxanə".

Bu beytdə deyilən "həmnəfəs", "həmxanə" sözləri məlumdur ki, kişinin arvadı deməkdir. Kişinin arvadına inanmamağa təhrik edən bu sözlər şübhəsiz bütün qadınlara aid deyildir. Qadın mücəssəməsi olsaydı nə möhkəm ailə olmaz, nə də övladlar düzgün tərbiyə edilə bilməzdi.





## RƏSUL DÜLGƏR

Rəsul Dülgər XIX əsrin əvvəllərində Şəki şəhərinin Yuxarı Baş məhəlləsində anadan olmuşdur. Şairin əsas sənəti dülgərlik, memarlıq xüsusiyyətinə malik bənnalıq olmuşdur. Uşaqlıqda təhsil almaq imkanı olmadığından, sonradan öz səyi ilə məşğul olmuşdur. Mütaliəsi onu da şeir yazmağa həvəsləndirdiyindən, asudə vaxtlarını şeir yazmaqla keçirmişdir. İstedadı, şairlik təbi yüksək olduğundan şeirləri rəvandır. Lakin, xüsusi təhsili və şeir haqqında məlumatı olmadığından bəzi şeirlərinin vəzni pozulmuşdur. Əsərlərindən bizə az bir qismi gəlib çatmışdır. Əldə olan şeirləri isə dağınıq və qarışıq haldadır.

Rəsul Dülgər ailə və qohum-qardaş, dost qədrini bilən, vətənini sevən, vətəni tərk edib yad ellərdə yaşayaraq, təəssübkeş olmayan adamları qınayaraq, onları vətənə qayıtmağa, vətənin qədrini bilməyə çağıran şair olmuşdur. Bu səpgidə şeirlərindən biri vətəni Şəkidən üz döndərən dostu Hüseynə yazdığı şeirdir:

"Yoxumdur səbrü aramım, qərarım qalmayıb əsla,
Fəraqın qoymayır bir ləhzə şüqlüm kəsbi-kar olsun.
Salıbsan bizləri gözdən, bu var: üz döndü, föz döndü,
Məhəbbət qəlbdə müzmər nə mümkün var kənar olsun.
Nədir bais ki, tərk etdin bu qədri sileyi-rəhmi,
Nə vəqtə kimi, bi mürvət, bu məxluq intizar olsun".

Rəsul Dülgər yüksək rütbədə olmağı, şöhrəti sevən adamları tənqid edərək göstərir ki, kasıb olmağa razı olmaq, mahlıq iddeasında olmaqdan daha yaxşıdır:

"Bəsi əsləhdi, dərviş ol, kilim altında rahət yat,
Neylərsən padşahlıq kim, sənə bu dünyadar olsun"

Rəsulun şeirlərində olan müsbət fikirlərlə yanaşı qəzavü-qədərə inam, səadəti Allahdan gözləmək kimi idealist fikirlər də vardır:

"Yetər mətlubinə elan tutan ümmid rəzzaqə,
Qalan məhrum o kəsdir kəsbinə ümidvar olsun.
Yapışsan həqqə sidq ilə səni dünya arar kəndi,
Bu növdür xasiyyət dünyaya harisdən fərar olsun.
Dolansan cəmi dünyanı qədərdən qeyri bir şey yox,
Qəzaya razıdır ol kəs ki, daim huşyar olsun.

Bu sözləri yazan Rəsul-Dülgər ataların "Səndən hərəkət, məndən bərəkət" sözlərini unutmasının nəticəsidir ki, səadəti, xoşbəxtliyi qəzadan gözləyir.

Rəsul Dülgər müsəlmanlar arasında parçalanma və nifaq hallarına qarşı çıxaraq, onları birliyə çağırır:

"Hərə öz rəyin eylərsə, görək dünya dolanarmı,
Gedərmi kəsbinə bir qul, əlində ixtiyar olsun.

O bu şeirdə müsəlmanları birliyə, bir-birinin rəyinə qulaq asmağa çağırdığı halda, digər tərəfdən də ağalar və





qullar dünyasını müdafiyə edir ki, bu da onun dünya görüşünün ziddiyyətli olmasının nəticəsidir.

Şair insanların şüurunda və əməllərində olan yaramaz halları da duyub hiss edərək belə halların aradan qaldırılmasında qeyrət və namusun böyük rol oynayacağına inanmaqla müsəlmanları qeyrətli olmağa çağırır:

"Müsəlmanlıq ibarətdir, yəqin dünyadə qeyrətdən,
Müsəlmanda gərək qeyrət, gərək namusu ar olsun".

Bütün bunlarla yanaşı Rəsul Dülgər zəhmət adamlarını həmişə sevərək onlara haqq qazandırmış, müftəxorların, din xadimlərinin riyakarlıq və acgözlüyünü kəskin tənqid etmişdir:

"Kimisi alim və şamil olub bu əsrdə qazı,
Başında bir pud əmmam satır alimlərə nazı,
Əgər bir təqsimə kətmə deyildir nəfsinə razı,
Sənə sən mürdəşir ilə bu ortaqdır, şərakətdir.

Rəsul Dülgər azadlığı, kökə bağlılığı hər şeydən üstün tutmasına aid şeirlərlə yanaşı mədiyyələr də yazmışdır.

Şair XIX əsrin ortalarında Şəkidə vəfat etmişdir.

Şeirlərindən nümunə.

**Nuxu**

"Tərif edim Nuxu yerin, yerləri gülşən kimidir.
Söylüyüb danışmağı, hər yeri bir can kimidir,
Baxarsan mal-dövlətli, dövləti sultan kimidir,
Ədli ədaləti adil Nuşərəvan kimidir,
İçinin məhbubələri huriyi qılman kimidir.

XXX

Çıxıban bahar fəsli məhbubələri çöldə gəzir,
Görənin tamam canı, yürəginin yağı ərir,
Onları görən oğlan on beş yaşındaca qarir,
Libasları zərü-ziba, bellərində türmə sarir,
Yanaqları gül yarpağı, qaşları kaman kimidir.

XXX

Ya Allah, yetməsin heç vəqt nöqsan bulara
Huri deyim, pəri deyim, yoxsaki insan bulara,
Hər gün kimsə desin huriyi qılman bulara,
Mən özüm incimərəm əgər verəm can bulara
Baxışları maral kimi, yerişləri ceyran kimidir.

XXX

Qolları gümüş kimi, gərdəki mina misli,
Tökmüş qıvrım telini sünbül və rəna misli,
Onları görən olar Məcnun rusva misli,





Yaradıb bir allahi cənnətdə Sona misli,
Saçları güləbətin, kipriki peykan kimidir.

XXX

Nə yaman dərdə saldı bu qaşları kaman məni,
Bilirəm öldürəcək bu dərdlər nihan məni,
Qurtara bu dərddən qadir sübhan məni,
Ölsəm əgər götürə bir sahib iman məni,
Bu dərd ilən ölsə Rəsul bil şəhid olan kimidir".

## MUSTAFA AĞA – ŞUXİ

Mustafa ağa Şuxi XIX əsrin birinci yarısında Şəki şəhərində anadan olmuşdur. Alim və şair Kərim ağa Fatehin oğludur. Mükəmməl təhsil alaraq, bir ziyalı kimi hörmət və nüfuz qazanmış, dövrünün mərifət və kamal sahibi olan ziyalısıdır. Səxavətli bir adam olduğundan onu bütün məclisləri maarifpərvərlər və şairlərsiz keçməzmiş. Əliaçıqlığı və səxavəti, dünya malı və dövlətində gözü olmadığı üçün əlində olan var-dövlətini xərcləyərək, ömrünün son vaxtlarında kasıb həyat sürmüşdür.

Çox rəvan və gözəl şairlik təbinə malik olan Şuxi poeziyanın bütün növlərində şeirlər yazaraq bir divanın müəllifi olmuşdur.

Onun şeirləri üslub cəhətdən nöqsanlı olsa da, məzmunca dolğun və faydalıdır. Belə ki, o bu şeirlərdə həsədi, paxıllığı, öz işini buraxıb özgə sözü danışmağı, ara qarışdırmağı, böhtan və xəyanəti, başqasını ləkələməklə zövq almağı, tərəqqiyə düşmən olanları, bir sözlə əsil insanlığa layiq olmayan hal və sifətləri ciddi tənqid etmişdir. O, öz dövrünün adamlarının əxlaq nöqsanlarını əks etdirən şeirlərinin birində bu barədə yazmışdır:

"Əgər kim, dərdini izhar edirsən sandığın yarə-
Ki, guya aləmə izhar üçün məmur naşirdir.

-------

Atıb öz karını cümlə biri həmdikəri halın
Təcəssüs eyləməkdə daima amadə nazirdir.





--------

Ucalda gər fələk həmmilətindən bir kəsin başın,
Dili-əqvami büxlindən müdam aşüftədir.

---------

Görünməz doğruluq əqvalü əməli-xılayiqdə,
Sərapa əyrilikdir feli mərdum hərçi sadirdir.

---------

Nolur bilməm bu əfal ilə karımız, yarəb,
Bu tərz ilə olub yekdigərindən cümlə nafirdir.

Şuxi öz vətəndaşlarının və din qardaşlarının belə pozğun xasiyyətdə, qəflətdə və pərişan halda qalmalarına böyük təəssüflə deyir:

"Yetdi dövran bizə bir vaxt, xudaya, səd heyif,
Vəzi-əyyam pərakəndə, nə bərca, səd heyif".

Mədhiyyələrdən ibarət şeirlərin əksəriyyətindən aydın olur ki, Mustafa ağa Şuxi dindar bir şair olsa da, şeirlərində vətənpərvərlik, azadlıq sevən, millət təəssübkeşi şair olmuşdur. Şeirlərindən bu da məlumdur ki, o, türk şairləri Mövlanə Cəlaləddin və müəllim Nacinin güclü təsiri altında olmuşdur. Ədəb və tərbiyəyə aid şeirləri bunu aydın sübut edir.

Şuxi 1895-ci ildə Şəkidə vəfat etmişdir.

Şeirlərindən nümunələr:

## Dağlar

"Salırsan baş çəkib evci-səmayə,
Nəzəri həqafət cahana, dağlar.
Seyrin edən sultanlardan, xanlardan,
Qalmayıb birindən nişana, dağlar.

XXX

Edən keşti-səfa çəməngahının,
Başında seyr edən noqəzalanın,
Sənə leşkər çəkən padişahların,
Görürsən yurdunu viranə, dağlar.

XXX

Yaylaqların firusilə səth edən,
Əzharü-əçcarın görüb mədh edən,
Qılığ ilə qələləri fəth edən
Nəzər qıl xan olan xana, dağlar.

XXX

O gözlər ki, sənə saldı nəzərlər,
Oldu torpağilə aqiştə yeksər,
Sən elə yerində bərca, müqərrər,
Baxarsan şir tək hər yana, dağlar.

XXX





Malikəm deyənlər bala-pəstinə,
Nabud olub lov çəkənlər üstünə,
Gülgün tac geyib rəfq məstinə,
Biqeyd durmusan şahana, dağlar.

XXX

Buludlardan pərdə çəkib hər dəmdə,
Hərgiz vəfa görməmisən hər dəmdə,
Tamaşalar seyr etmisən aləmdə,
Baxdıqca gərdişi-dövrana, dağlar.

XXX

Abi zülalından sirabdır aləm,
Səninlə görüşür Şəmsi-müəzzəm,
Sayeyi-lütfündə firavan ümən,
Gərgidir nəmtü-ehsana, dağlar.

XXX

Suxiya zamani-güzəştə halın,
Bu dağ üzrə keçən cümlə əhvalın,
Vəfasız cahanın edib xəyalın,
Qərq olur yürəgim al qana, dağlar.

## Gözlərin

Gözləri xütəndir dövreyi-zülfün,
Cərayə durubdur ahu gözlərin,
Miyani-məxluqə fəsadü yağma,
Salır dolandıqca hərsu gözlərin.

XXX

Bileydim həqiqət eyni-mətləbin,
Nazdır aşiqə ya ki, qəzəbin,
Bağrımı qan edib yaquti ləbin,
Gönlümü viranə cadü gözlərin.

XXX

Şəme-ruxsarına dildə pərvanə,
Türrəyi-mişkini elər bir yanə,
Olub nəşəsindən məstü-məstanə,
Oldıqca zülfündən xoş bu gözlərin.

XXX

Gülşəni-nemətdə, ehsan içində,
Ariz gülgünü ənabdan içində,
Durubdu hər zaman al qan içində,
Çəkərmi qətldən qayğu gözlərin.

XXX





Dövləti-vəsfinə olan möhtaca,
Xanəü-firqətdən səy et ixraca,
Tökübdür üstümə qəsdi-paraca,
Bir böyük ləşkəri-hindu gözlərin.

XXX

Yetişməz dilbərim hərgiz fəryada,
Şuxini qəmlərdən etməz azada,
Qəsdidir hər zaman fitnə-fəsada,
Eləməz bir kari-nikü gözlərin.

## MƏHƏMMƏD ŞƏMƏDÜZ

XIX əsrin ikinci yarısında yaşayıb yaradan Şəki şairi Məhəmməd Şəmədüz 1867-ci ildə Şəki şəhərində anadan olmuşdur. Çarıqçılıq sənətilə qazandığı cüzi vəsaitlə fəqir həyat sürmüşdür. Kasıbçılıq üzündn yüksək elmi təhsil ala bilməmişdir. Oxuyub yazmaq öyrəndikdən sonra mütaliə vasitəsilə getdikcə biliyini artırmışdır. Fitri istedadı və şairlik təbi yüksək olduğundan boş vaxtlarında sadə, ana dilində gözəl, ibrətamiz şeirlər yazmışdır. Buna görə də xalq arasında yaxşı şair kimi tanınaraq, böyük hörmət və nüfuz qazanmışdır.

Onun müasirlərindən üstünlüyü ondadır ki, o "qəzavü-qədərə", "çərxi-gəcrəftara" inanmır və bu kimi fanatizmə inananları da tənqid edərək, onları fanatizmdən xilas etməyə səy edirdi:

"Çərxi-gəcrəftar özü sən kimi bir məxluqdur,
Sən də qıl öz dərdinə hər dəm dərman, ağlama".

Şair şeirində insanlara təkcə "Qəzavü-qədərə" inanmamağı tövsiyə etməklə kifayətlənməyib, onları mübarizəyə dəvət edir:

"Çün qəza tiri səni etdikdə nişan, ağlama,
Bax əlacın var isə, tut qarşı qalxan, ağlama".





Şair insanları dost cildinə bürünərək başqalarına, hətta öz dostlarına belə, pislik edənlərə inanıb aldanmamağa, onlardan uzaq olmağa, onlara sirr verməməyə çağırır:

"Aqilü huşiyar etmək gərək sirrini pünhan,
Öldürür bu qəm səni, bihudə pünhan ağlama,
Hər görən insanı dost sanma, cahanda aqil ol,
Nari-neyrandan betərdir, təni-düşmən ağlama".

Belə ibrətamiz fikirlər söyləyən, nəshətlər edən şair bir tərəfdən xalqı gəcrəftara qarşı mübarizə etməyə çağırdığı halda, nədənsə bəlayə, pisliyə, haqsızlığa səbir edib dözməyə də çağırır:

"Aşiqi-sadiq olan hər dərdə qatlanmaq gərəkdir,
Səbir qıl, səbir əhlinə yavəri sübhan, ağlama".

Şəmədüz bu fikrində daha da irəli gedərək, hər çətin işin Allah tərəfindən asanlaşdırıldığı üçün Allahdan rəhm gözləməyi tövsiyə edir:

"Ey Şəməduz , ol xuda müşgül guşa olmuş bizə,
Neçə müşgül, karın olsa, eylər asan, ağlama".

Şairin bəzi şeirlərindən anlaşılır ki, o, nəsihətamiz şeirlər yazmaqla yanaşı məzhəkələr də yazmışdır. Dostu "Nasir" təxəllüsülü şairə yazdığı şeirdə bu aydın şəkildə əks etdirilmişdir:

"Aşiq gərək ah edəndə qan tökə,
Bir məsəldir: Nər yükünü nər çəkər,
Yazmış idim neçə kəlmə məzhəkə,
Nə şairsən məzhəkədən sönmüsən"

Şair məzhəkə yazmağı kefi durulanda vasitə hesab edir:

"Onun üçün tənə yazırsan mana,
Bundan sonra sataşmaram mən sana,
Tap, ver oxut dilbilən yoldaşına.
Zənnun itib sən qəmə boyanmısan".

Şəmədüz bu şeirində şairin hər tərəfdən düşünən, hər gizli nöqtədən bir məna kəsb edən sənətkar olmasını tələb edir:

"Sınan kimsə nöçün girər meydana,
Şair gərək nöqtədən şey qana".

Şəmədüz 1899-cu ildə, 32 yaşında Şəki şəhərində vəfat etmişdir.





## MOLLA İBRAHİM XƏLİL - DODUİ

Şəki şairlərindən biri də Molla İbrahim Xəlil Doduidir. O, 1860-cı ildə Şəkinin Dodu məhəlləsində anadan olmuşdur. Doduda yaşadığı üçün "Dodui" təxəllüsünü qəbul etmişdir. Onun bir başqa təxəllüsü də "İbrahim"-dir.

O, təhsilini molla məktəbində aldığı üçün türk və fars dilləri ilə yanaşı, ərəb dilinə və elminə də dərindən yiyələnmişdir. Şairlik təbi və istedadı sayəsində bir sıra sadə, mənalı, lirik və tənqidi şeirlər yazmışdır.

Ərəb dilində təhsil almasına baxmayaraq, Azərbaycan dilində yazdığı şeirlərində başqalarına nisbətən ərəb söz və tərkibləri azlıq təşkil edir.

Əldə olan şeirlərindən məlum olur ki, "Molla" adını daşımağına baxmayaraq, o avam kasıbları dinlə qorxudub, aldadaraq var-yoxunu fitrə-zəkat adı ilə əllərindən alıb çardağını taxılla dolduran tamahkar, acgöz mollaları şeirlərində həcv edərək, kəsgin tənqid atəşinə tutmuşdur. Belə şeirlərinə nümunə olaraq aşağıdakı beytləri misal göstərmək olar:

"İllikdən o yanə olur azuqəsi əfzun,
Çardağına get, bax neçə xarvar görünmüş.
O yan Babaratma, bu yanı Dəhnəçapaqan,
Cümlə nəzəri-xəlqdə murdar görünmüş.

Hər verdiyi ənvayi-nizm var ikən onda,
Başərmiliyi aləmə izhar görünmüş.
Hər qədr yığa, söyləyəcək olmadı bir şey,
Bir dəfə onun adəti inkar görünmüş"

Bu beytlərdə diqqəti cəlb edən budur ki, şair öz sinfindən olan belə adamları güzəştə getməyib mollaların həris və tamahkar olduğunu qeyd edərək göstərir ki, molla qismi nə qədər sədəqə, ehsan və zəkat yığsa da, bir şey olmadı deyəcəkdir. Bu da onların sinfi təbiətindən doğduğunu göstərir.

Lirik şeirləri həqiqi və təbii eşq və məhəbbətə həsr edilmişdir. O, bu şeirlərdə həqiqi və təbii eşq-məhəbbətin sahili və hüdudu olmadığını göstərərək qeyd edir ki, belə eşq-məhəbbət yalnız insan öldükdə onun qəlbindən çıxır:

"Eşq bir bəhrdir kənarəsi yox,
Tərki-candan səvayi çarəsi yox".

Şairin dialoq formasında eşq-məhəbbət ifadə edən şeirləri sadə, aydın və məzmunca daha qüvvətlidir:

"Dedim: - Gönül, səni bu halə dərdi-yar salıb....
Dedi: - Bəli, bəli, əlbəttə, bir nigar salıb.

Dedim: -Xəzan dəlidirmi beylə pərişansan?
Dedi: - Fərağ qəmi, nə xəzan, bahar salıb.

Dedim: - Bu hüsndə Yüsifmisən, Züleyxasan?
Dedi: - İkisi bərabərcə yadigar salıb.

Dedim: -Bu məhnəti-hicranə yoxmu bir əncam?
Dedi: -Nə çarə qəzayə ki, girdgar salıb".

Şairin bir sıra dini şeirləri də vardır. Bu şeirlər əsas etibarilə peyğəmbərin mədhinə həsr edilmişdir.

Molla İbrahim Xəlil Dodui 1900-cu ildə, 40 yaşında yaşadığı məhəllədə vəfat etmişdir.





## DƏLİ BƏBİR

XIX əsrdə Şəkidə yaşayıb yaradan şairlərdən biri də Dəli Bəbirdir. Doğulduğu və öldüyü il dəqiq məlum deyildir.

O, əsasən lirik şeirlər yazmışdır. Əlimizdə olan şeirlərindən məlum olur ki, ustad sənətkar olmuşdur.

"Dilbər, sənin ol gülşəni gülzarına qurban,
On dörd gecəlik ay təki rüxsarına qurban,
Əyri qaşına, tirreyi-zər tarına qurban,
Süzgün gözünə, çərgisi-xumarına qurban.
Ey sevimli yarım,
Ey türfə nigarım,
Sənsən gülü zarım,
Yox səbri qərarım".

XVIII əsrin sonları və XIX əsrin əvvəlləri Şəki mahalında Şəkili-Hüseyn Qəmnak, Şəkili Hatəm, Şəkili Cami, Şəkili Osman Biçarə, Şəkili Molla Türab, Şəkili Lələ, Qışlaqlı şair Molla Məhəmməd, Göynüklü Mahmud Əfəndi, Vardanlı Kərim mücrim, Hacı Əfəndi, Padarlı Abdulla Əfəndi və Nasir kimi şairlər də yaşayıb yaratmışlar. Onların tərcümeyi-halı haqqında müfəssəl məlumatımız olmadığından şeirlərindən nümunələr verməklə kifayətlənirik.

## ŞƏKİLİ HÜSEYN QƏMNAK

### Ağlaram

Keçən günü, ay gül üzlü dilbərim,
Yadə salıb, vallah yarım, ağlaram,
Hər yerə getsə də mənim xəyalım,
Gönül arar meh ruxsarın, ağlaram.

XXX

Əvvəl məhəbbəti bünyad eylədin,
Sonra bivəfalıq icad eylədin,
Aləmi şad, məni nişad eylədin,
Mən gedirəm gülzarım, ağlaram.

XXX

Mən valehəm sənin xətti xalına,
Əlvanına yaşılına, alına,
Gönül quşu məftun olmuş halına
Gecə-gündüz ey nigarım, ağlaram.

XXX

Didarına mən müştağam, mən müştaq,
Vəqt bi bəqt çəkməkdəyəm iştiyaq,
Öldürəcək məşuqunu bu firaq,
O səbəbdən, şivəkarım, ağlaram.

XXX

Qəmnak, sevibsən dilbəri-rənanı,
Adın-sanın bürümüşdü al kanı,
Divanəni gözünü aç, bil tanı,
Abdullahın ol vallahı ağlaram.





## ŞƏKİLİ HATƏM

### Oldi

Əyyam nəhsdə, qəmərdə, əqrəbdə,
Bir neçə kəslərə səyasət oldi.
Kifar batilin zəxmi tiğindən
Möminlər qəlbi narahat oldi.

XXX

Fəzla əhlindən bir neçə adəm
Fələk diyarində əqli fərahəm.
Oxundi guşinə fərman matəm.
Qəlbimin hasili məlalət oldi.

XXX

Tutmasın kafirə heç kəs ixlasi,
Qərinə oğrayan tapmaz xilasi,
Səbir edib qəzayə olmadi asi,
Meynudə rütbəsi bəlağət oldi.

XXX

Məlul baxır hər biri bir diyarə,
Bir kimsə yoxdur ki, eyləsin çarə,
Gözlərin bağlayıb çəkdilər darə,
Gör ki, nə bidad, nə afət oldi.

XXX

Bənd edib onlari ağaclara tənk,
Nizama durdular guya edir cəng,
Çatladı bir dəfə iki yüz tüfəng,
Mətan ömrümüz xəsarət oldi.

XXX

Kafirlər bunları etdi nişanə,
Bulaşdı əndamı al qızıl qanə
Görübən xəlayiq düşdü əfqanə,
Məhşərdən bu da bir əlamət oldi.

XXX

Çevirib ətrafın iki səf soldat,
Dolanır əlində tuği qəməndat,
Cüzm sadiəbənlərə həyatdan məmat,
Qan yaşi çöllərə rəvayət oldi.

XXX

Yığılıb başına qohum qardaşi,
Çeşmi nədamətdən tökdülər yaşi,
Beylə nəqş edib qəza nəqqaşi,
Hər nə oldi həqdən inayət oldi.





XXX

Hər ata ki, ayrı düşə pəsərdən,
Əyləşib hüzndə sorar hər yerdən,
Gəl eşit xəbər-pədərdən,
İtirmiş Yusifin, qiyamət oldi.

XXX

Bu zaman əqli başından uçdi,
Vay oğul deyibən torpağa düşdi,
Fəryad fəğanın dəftərin açdi,
Çeşmi təknə bəfazət oldi.

XXX

Yarəb, necə olur işlər əncami?
Yetmiş fəryadə, ol intiqami,
Kafir əlində əsirdi hami,
Müsəlmanın işi bəğayət oldi.

XXX

Əlbəttə məxvi deyil hüşiyarə,
Günbəgün məişət düşür dişvarə,
Hatəm, bü mülkdən özgə diyarə,
Köç, imdi vəqt rəhalət oldi.

## ŞƏKİLİ CAMİ

### Barama

Ustalar, qulaq asın tərif edim baramanı,
İbtida sərto çıxmayır ha döyürəm baramanı,
Altından kəfkir salıb qaldırıram baramanı,
Şe.məyədək qalxmağa yoxdur onun heç amanı,
Nə deyim bu sözümün yoxdi xilafi, yamanı.

XXX

Çox məşəqqətlə keçirib mağaradan bağladım,
Yaxşı işləsin deyibən mağaranı yağladım,
Asta-asta basıban çarxın havasını saxladım,
Heç dolanmadı, qırıldı axırı zar ağladım,
Nə deyim bu sözümün yoxdi xilafi, yalanı.

XXX

Çün qırıntı ilə doldurdi çarxın qoluni,
Sahib mal gəlibən göstərdi ona yoluni,
Ustanın beli sınar tərpədə bilməz qoluni,
Nə deyim heç görməmişdim yenkilonun çölüni,
İnanın bu sözümün yoxdi xilafi, yalani.





XXX

Növbəti zülmlə mən eylədim tamam kamal,
Pəndir əppək yeməyə heç yoxdur məndə macal,
Çün düşünüb bağlaram görünər o məsəl, qıcal,
Əyari astar yarım, bəlkə də ondan da cəhal,
Nə deyim bu sözümün yoxdi xilafi, yalani.

XXX

Molla cami bu işə düşməmiş idi heç vəqt,
Nə deyim baramanın nüvadidir əzsənin süxxət,
Su, içində düzəlir incəlməkdən əyri xət,
Səy ilə iki ildir götürmək istər vəqt-vəqt,
Nə deyim bu sözümün yoxdi xilafi, yalani.

## ŞƏKİLİ OSMAN (BİÇARƏ)

### Şeyx Şamil

Şeyx Şamil ki, bu gün qeyrət islam eylədi,
Nüsrəti bəxt buna izd və yezdan eylədi.
Verməz həqqi nahəqqə çün iqrar iman eylədi,
Fəth Xünzaqüstündə hamını bəyan eylədi,
Min beş yüz kafir qırıb cəhənnəmə idxal eylədi.

XXX

Nasirəl islam onun qılıncın kəsgin eyləsin,
Kafirin də həmişə məhv münhəzm eyləsin.
Nüsrətəngiz bədr kimi kəşf Dağıstan eyləsin,
Qəzavəmi buymuş kafirə qalib eyləsin,
Qadir Allahımız bizi mənsur müzəffər eyləsin,
Şir yəzdan hünəsin guya məlum eyləsin.

XXX

Əl götürüb sidq dildən Şamilə dua eyləyin,
Mürşid kamil olur, cahan fəramuş eyləyin.
Aşiq sadiq olur, eşqi min nuş eyləyin,
Aqibəti xeyir gəlir kafir dinin puç eyləyən,
Dinin yıxıb kafirin məğmun eyləyin,
Gəlib Şamil şəninə şanını bəyan eyləyən.





XXX

Qadir allah yet dadına gəldi Dərvənd üstünə,
İnşallah hifzindədir səngərə Quba üstünə
İlisuya Qarabağda Cari durmaz qəsdinə,
Qubadan keçər gələr Şirvan, Gəncə üstünə
Şəkini, mahallarını tamamən alır dəstinə
Yeni təxsir edib hökmü Süleyman eylədi.

XXX

Ey Osman, (biçarə), sən laf etmə, gəl əy başını,
Eşidib ey din düşmanı, yaman yüzlər çəkki,
Qandalaq ey əllərində qoyarlar qaç ki,
Tənə bir söz deyil ha, mövlayə tapşır işini,
Qəzavəti kafir içində çəhid eylə başını
Görən desin Şamil yoluna canını qurban eylədi.

## ŞƏKİLİ MOLLA TURAB (BİRİNCİ)

### Müxəmməs

Al, yaşıl, abi, sari, bənövşə, qara, qırmızı,
Alarsan, gedərsən həmişə yarə qırmızı,
Çikəni ətlas, ola dizlik xarə qırmızı,
Sürətə şölə salıb dönə bahara qırmızı,
Yandırma nahaq bizi, yanarsan narə, qırmızı.

XXX

Hər kimin vari ola ev tikdirər xanəsi ağ,
Dolanar çiraqinin başına pərvanəsi ağ,
Bir uşaq ki, ağ ola olur onun anəsi ağ,
Kim görübdür ki, yarın sürəti gül çənəsi ağ,
Ləblərindən əməsən dönər şəkərə, qırmızı.

XXX

Tari yaxşı yaradıb göy ilə asimanı abi,
Dibi yox, kənari yox, dolanır dörd yani abi,
Ürpəyi zər alafa, çarqatı tumanı abi,
Tutulub dörd tərəfi ləl-gövhərə, qırmızı.

XXX

Dərdimə eylə dəva, ey yüzi ağ, xali qara,
Qoyma dünyada qalım baxtı qara, halı qara,





Çox keçər aşiqinin ayi qara, Sali qara,
(Birinci)-nin beylə olub, neynim iqbali qara,
Yalvarıram tari qıla təzlicə çarə qırmızı .

### Tiflisin tərifi

Məcmun hər vilayətdə ağırdı dağı Tiflisin,
Bahar çağı cənnətə oxşuyur bağî Tiflisin,
Bir yekə tamaşadır əlvan otağı Tiflisin,
Ölüsü mələk kimi, maraldı sağî Tiflisin,
Dil ilən təriflənməz arvadı, uşağı Tiflisin.

XXX

Tiflisin bərabəri Çeçen, Dağıstan da deyil,
Bakı, Dərbənd və Quba, Qızlar Həştərxan da deyil,
İrəvan və Qarabağ, Gəncə Naxçıvan da deyil,
Şam və səlmasi, Marağa, Təbriz, Tehran da deyil,
Yığasan İran, Turan olmaz dırnağî Tiflisin.

XXX

Şəhri Tiflis içində yetmiş iki millət gəzər,
Kimisi yaşıl geyər, Kimi geyər laləzər,
Jinral bölüyün saysan olur həzar,
Min dəftərxanəsi var, divan üçün yazi yazar,
Gecə ta yariyadək açıq olur dükan, bazar,
Çox hesabsız satılır çaxır, arağı Tiflisin.

XXX

Tiflis gözəllərinin sürəti bənzər laləyə,
Hər kəs görsə olari o saət düşər bəlayə,
Minirlər duruşqanı gedirlər orta Çalayə,
Evlədə kef və zövq səsləri çıxar naləyə,
Hər kəski vinovat olur salırlar Narin qaləyə,
Deyərəm ki, beş yüzdən çoxdur dustağı Tiflisin.

XXX

Ağalar, qulaq asın, vəsf Gürdüstanı deyim,
Cəmi Tiflisdə olan millətlərin sayin deyim,
Baş açıq gürcü, urus, firəng, müsəlmanı deyim,
Ləzgi, Qabardin, erməni, ingilis, moltanı deyim,
Gündə çıxan güllü mətah və kərvani deyim,
Gün batandan gün doğan bilir sorağın Tiflisin.

XXX

Tiflisi görən kimi, yekdi dərdim oldu çahar,
Kür daşıb, arasında açılıbdır təzə bahar,
Tavadlar geyinirlər hər biri bir özgə təhər,
Atəşsiz hamamı var, kim görübdür beylə şəhər,
Miskin (Birci) kəşf edir Tiflisi axşam və səhər,
Çünki qalıb olmuş tazə qanaği Tiflisin





**Vay günü**

Gör necə dönübdür dövr zəmanə,
Vay günüdür müsəlmana vay günü,
Möhtac olduq axirətə, imanə,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Kaşki bina qoyulmayaydi bu günə,
Kimini darə çəkdi, kimini şişə,
Yaz gününü döndərdi zəmhərir qışa,
Vay günüdür müsəlmana, vay günü.

XXX

Əqilsizlərdən bu işləri eyləyən,
Əldən gəlməyəni dildə söyləyən,
Ata çatmayıb fili boyləyən,
Vay günüdür, müsəlmanə vay günü.

XXX

Yığdı ləşkəri binizam xan oldu,
Hər kəs durub öz başına xan oldu
Peşəsi dilənmək, xan haçan oldu?
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Durdi qazi Əhməd bir ad eylədi,
Yıxdı ölkələri bərbad eylədi,
Qaçdı öz başını azad eylədi,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Pozğun düşdü qoşununa, saninə,
Baxmadılar nə sultanə, nə xanə,
Dağıldı dağları hərə bir yanə,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Qəzavətə hücum etdi yüzümüz,
Ax-vay oldu axırımız, günümüz,
Heyif, zayə getdi gözəl dinimiz,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Yığdı baş biləni tökdü qələyə,
Düşdük müsibətə, yaman bəlayə,
Baxmadılar ata, ana, balayə,
Vay günüdür müsəlmanə, vay günü.





XXX

Avar, qumuk, Qafqaz tac və təxtini,
Dərbənd, Bakı, Quba, Sambur bəxtini,
Yandırdı Köyünü, şəhri Axtını,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

(Şahu xan) deyib gəldi bir öküz,
Bir şilə saqqallı, bəslənmiş xoruz,
Dava ilə heç olmadı yüzbəyüz,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Müsəlmanın axırıdır axırı,
Həq özüdür bu işlərin baxarı,
Sirkəni döndərib verir çaxırı,
Vay günüdür müsəlmanə, vay günü.

XXX

Qalmadı aləmdə ya yazi yazani,
Nə göydə uçanı, nə yerdə gəzəni,
Miskin (Turab) necə versin əzəni,
Vay günüdür müsəlmanə, vay günü.

## ŞƏKİLİ LƏLƏ

### Axtı

Axtının bax gör necə yaxşı, gözəl halları var
Danışan şirin-şirin farsı, ərəb dilləri var,
Açılan hər tərəfə al və qızıl gülləri var,
Gözüdür Dağıstanın kamallı, çox elləri var,
Bax bu Axtı şəhərin gör necə gözləri var.

XXX

Əbu müslüm burada məscid tikib daş qoydu,
Qırıban kafirləri qələləri baş qoydu,
Bir neçə mələk enib, səcdə edib, baş qoydu,
Heç bəla görməz olar talei iqballarıvar.

XXX

On beş yerdən aza səsi yetir o ərşi-rəhmana,
Şeytan ləlin eşidib döner ciyəri al qana,
Qılıncın zərbətindən kafirlər gəldi imana,
Aləmə məkandırlar zikirdə mollaları var.

XXX

Yüzbaşılar oturub söhbət edərlər con kibi,
Geyibən zər xələti hər birisi bir xan kimi,
Kimgədə divan qurarlar Misirdə Sultan kimi,
Belə ədalətli yerin bilin ki, ahılları var.

XXX

Qoç iyidlər atlanıb düşmən qabağına çıxar,
Edərlər cəngü savaş, su yerinə qanlar axar,
Neçə səngər dağıdıb, bürci qələləri yıxar,
Bu yer aslan yeridir, yırtıcı cahilləri var.





XXX

Şəhərin hər tərəfi açılmış lalə kibidir,
Bilmək olmaz yolunu xeybəri qalə kimidir,
Eşqdən məst olubən gözlər piyalə kimidir,
Şəki, Şirvan, Qarabağ almağa xəyalları var.

XXX

Şəhrin əhlü qəmu yaxşıca hörməti dürər,
Çəkilir adları hər ölkədə heybətli dürər,
Nə qədər gəlsə qonaq mehmanə xələtli dürər,
Şəkili Lələ təki bir talesiz qulları var .

## QIŞLAQLI MOLLA MƏHƏMMƏD

### Tiflisin

Qazilər sizdə bilin necədir halı Tiflisin,
Əyləşib Sərdar urbil, cahü-cəlalı Tiflisin,
Polkovnik, mayorbaşı, həm jaranalı Tiflisin,
Əskəri, həm ləşkəri, hər bir qıralı Tiflisin,
Aləmi əfsarda yoxdur misalı Tiflisin.

XXX

Hər səhər yüz min dəvə yüklər, çəkərlər hər yana,
Min meşoq birdən tökərlər arpa, buğda bir yana,
Memkünat yoxdur ki, bir saat tərazü dayana,
Yeddi yüz əsnaf çəkər, yoxdur məcalı Tiflisin.

XXX

Tiflisə vaqon gəlir ipəkdən, yundan ötrü,
Xali, tirmə, xalça, barama, göndən ötrü,
Qonşu uşağı gəlir düyüdən-undan ötrü,
Həftədə sursat gəlir qəmu qonşudan ötrü,
Pul kəsir hər gündə barkeş hanbalı Tiflisin.

XXX

Sövdagər, tüccar üçün qafilə gəlmiş bazara,
Parçanı dutmaz dalanlar, qəndi həm karvansara,
Anbarın gördüm əcəb oxşardı alçaq dağlara,
Xəzinə çox milyon görür guya xəzəldən pulları,
Bir-birindən varlıdı kəndi, mahalı Tiflisin.

XXX

Tiflisin barxanasın çəkərlər çox Dağıstana,
İravana, ingilisə, İstanbula, İsfahana,
Misirə, həm Şama gedər, Təbrizə, İran, Turana,





Bu tərəf köhnə şəhər Bakı, Quba, Hacıtərxana,
Qabağı Rusiyədir Qafqazdan dalı Tiflisin.

XXX

Darandaz, duruşqalar fayton qoşarlar atlara,
Yeri Sərdar bağına, qol boyun ol tavatlara,
Yeddi dağın çiçəki açılıbdır həyatlara,
Samazirə, canişinə, bir siz baxın tatlara,
Baxarlar artırmalan, gözəl maraqlı Tiflisin.

XXX

Tiflisin əcazi var: isti sular yaxşı hamam,
Sağ olan, sayriolan, gündə gəlir yüz min adam,
Hər zaman yetmiş iki millət olur orda tamam,
Çalğıçı, sağıçı, oxucuları nami-bənam,
Qarışır bir-birinə qıtal cidalı Tiflisin.

XXX

Tiflisin əcazı var: isti sular, yaxşı hamam,
Yerbə-yer nizam durur, vurulur təbülü balaban,
Əlli min soldat ilə bol qara bərk oldu tufan,
Top, tüfəng guruldayıb oldu dolu, gün ah, fəğan,
Olmaz həm saz, gərənay mizqanı xali Tiflisin.

XXX

Tiflisin körpülərin yerdən götürmüş ustalar,
Gəc ilən, kərpic ilən, üstü otaq artırmalar,
Qurquşun dəmir töküb, üstləri tac, altı sular,
Özgə xərcin desələr, dünya pul olsa qurtarar,
Günbə-gün üstə gəlir dövləti, mali Tiflisin.

XXX

Bazarın altı dükan, üstü otaqlardı tamam,
Balkonu altda limon şaxbudaqlardı tamam,

Gecələr şamlar yanır, lampa çıraqlardı tamam,
Gənci on, on beş yaşındakı uşaqlardı tamam,
Çalınır kamançalar, təbülü, qavalı Tiflisin.

XXX

Suları Kürdən olur, yerləri yaylaqdı səfa,
Bişirirlər şəkərçörək özlərinə, yoxdu cəfa,
Zər bürüncək götürürlər, ətlas xaravü-istifa,
Bir tərəfi sınax olar, bir tərəfi Ağstafa,
Araba, karvan olurmuş yolu Sali Tiflisin.

XXX

Mirzəyef yapıbdır Kür üstündə bir yaşıl otaq,
Qızıldan qəndil asılmış, şami çıraq,
Kürsülər qutkidir, fərşi zərəbcətdi səyaq,
Qırx sutun, altı qapı, mərtəbəsi yeddi rəvaq,
Zərü-zibadı tamam dəmir zəhalı Tiflisin.

XXX

Tiflisi mədh qılan bir şair yoxdur yarana,
Hər kimin düşər yolu baxar o sərdar dövrana,
Şəkili Məhəmməd ol günki çıxar tel vurana,
Çox uzun söyləməyi Allah yaradıb qurana,
Yaşi imarətləri var xüyli bahali Tiflisin.

XXX

Nəsirəddin şah gəlir hanınca top və topxana,
Namesnik Tarxanov qabağınca basxana,
Var onun otaqları döndü gecə ali şana,
Əlli pud barıt yanıb dünya tutuldu dumana
Ərəsət qopdu görün noldu zavalı Tiflisin.





## GÖYNÜKLÜ MAHMUD ƏFƏNDİ

### Mnacat

Ey cümlətən məzlum olub, məhbus olan canlar,
Xüsusən alicahlar, bəklər, hacılar, müsəlmanlar,
Salam olsun sizə çox-çox əzizlər nuşecanlar,
Xudaya eylə bu məzlumların dərdinə dərmanlar,
Bunlari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

İlahi, bunların əhvalına əhli mcahan ağlar,
Qəmu pərəndə çərəndə məkan ilə zaman ağlar.
Xəlayiq cümləsi, malaikə ins və cins ağlar,
Zəmin, yeddi fələk kirsilə ərş və asiman ağlar,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Buların əhli əyali ruzuşəb hər vəqt hər an ağlar,
Yeməz, içməz, yuxu görməz, çəküb ah və fəqan ağlar,
Olub Ceyhun təki gözlər, axar yaş rəvan ağlar,
Kimisi yaş tökür, kimisi irin, kimisi qan ağlar,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Buların yüzlərinə aç qapını bab rəhmətdən,
Yazıq qullarını dur, eyləmə dərgah izzətdən,
Özün öz nemətinə bəslüyübsən, salma adətdən,
Qəme müşküllərini həll edib qurtar məşqətdən,
Buları sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Salam pəncin ardınca qapıda durub çox-çox,
Mnacat eyliyüb, dərgahına yalvarıram artıq.
Kalamında bizə ədüvvü düşübən eylədin buyruq,
Sənin qapından yalvarası qeyri qapı yox,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Ey xaliqi aləm, xaliqimsən, zülcəlalımsan,
Qəmu xeyir ilə şəri xəlq edənsən, bimisalımsan,
Kərəmli padşahımsan, görürsən zəif halımı sən,
Fəqirəm qapına gəldim, məvişim ver suvalımsan
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Həbib mənə verdigin meraca bağışla,
Sənin dəvətinə gəldikdə qoyan tacə bağışla,
Görüb xələt, minib braq gələn həccacə bağışla,
Mədinə, Məkkə, qüdsə, gələn həccacə bağışla,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Bağışla ənbiyayə, əvlilayə, zati üfranə,
Vəhm yüz dörd kitabə, incilə, Tövratə, quranə,
Qılma lövhə əflakə. Zəminə ərşi rəhmanə,
Mələklərə, kərəmi xəlqanə, çin ilə insanə,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Bağışla vəhdətinə, qüdrətinə qadir minan,
Bizə şəfqət nəzərilə baxubən eyləsən xəndan,
Kərəm dəryalar ki, həqqimizdə eyləsən cuşman,
Özün lütf və kərəm qəhrindən eylə bizlərə ehsan,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.





XXX

Şərikin yox, nəzərin yox, mənzərə pak yəzdanım,
Ədufumsən, qəfurimsən, qəmü üsyanə cüfranım,
Eşidirsən mnacatım, səmimsən kərəmkahım,
Qəmu dərdlər davası, sən icabat eylə, dərmanım,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Fəqir, biçarə, miskin, ey əzizxlər, ulu qardaşlar,
Sizin əhvalınıza gözlərimdən axır yaşlar,
Ciyərim yandı, ox-ox cism və canə düşdü atəşlər,
Dekilmümkün sizi görmək, yolum dolu tikan, daşlar,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

XXX

Şəhabəddin avar xanı Dağıstandan çəkib leşkər,
Enib Kişdən yeridi Qaxmuğa təkin, olub sərvər,
Qayudub qaçdı bizi yondurub yıxdı o rus pərkər,
Olanda sol səddicərdə, tutuldi hacılar, bəklər,
Bulari sən xilas eylə, aman xaliq, aman mövla.

## PADARLI ABDULLA ƏFƏNDİ

Başına döndüyüm xubların şahı,
Bir de görüm indi kimə yar oldun,
Kim öyrətdi səni, kimlər ayırdı?
Kimlərin eşqində biqərar oldun.

XXX

Mən çəkdim yolunda cövrü cəfanı,
Sən sürdün qeyri ilə zövqü səfanı,
Yenə üzdün məndən əhdü vəfanı,
Kimlərin sözülə məndən zar oldun.

XXX

Haçan dilbər, iki kəlmə danışdıq,
Bir xəlvətdə bir-birimizə qarışdıq,
Haçan görüm öpüb, qucub, barışdıq,
Haçan dövran sürüb bəxtəvər olduq?

XXX

O şeytanın görüm işi zar olsun,
Doğranıb tökülüb xalqa car olsun,
Bir yara can ver ki, sana yar olsun,
Sən ki, gedib özgələrə yar oldun.

XXX

Qəm çəkməkdən canım üzüldü billah,
Dilbəri görsəniz, deyin siz allah,
Neyləmişdi sənə fəqir Abdullah?
Əğyarə gül olub, ona xar oldun.

XXX

Ey şux mənim yari vəfadarımsan sən?
Bu işvədə çün yari-dilazarımsan sən?





Bir zalımi-birənmü cəfakarımsan sən?
Ey afəti-dövran,
Ey xusrovi-xuban,
Canım sənə qurban,
Ey dərdimə dərman.
Bişübhə mənim eşqdə dildarımsan sən?

XXX

Hər baxışı bir ahu, mənim canım alıbdır,
Şəfqət nəzəri gönlümü sevdaya salıbdır,
Heyva kibi hicr içrə bu rəngim saralıbdır,
Qəm çəkə-çəkə daxı gözüm yolda qalıbdır,
Ey talei-bərbad,
Mən əmrinə münqad,
Fəryadinə fəryad,
Eylə məni azad,
Ey qaşı hilal yar kamandarımsan sən?

XXX

Bəsdir bu qədər cövrü cəfalar, sana qurban,
Seyr eylə sürüb zövqü səfalar, sana qurban,
Mən görməmişəm səndə vəfalar, sənə qurban,
Gəl dərdimə qıl bicə şəfalar, sənə qurban
Güldür məni hər dəm,
Et dərdimə məlhəm
Ey sirrimə məhrəm,
Sultan mükərrəm,
Nazik bədəni yengi yetən narmısan sən?
Canım üzülüb ha belə dövranın əlindən,
Ey çərxi fələk qalmışam hicranın əlində,
Ömrüm tükənib bir belə cananın əlində,

Bir zalimi-bidad can alanın əlində,
Ey mahirü kamil,
Ey mahə müqabil,
Qılma məni zail,
Ol sən buna qail,
Abdullahın ol vallehi-qəmkarımsan sən?





## VARDANLI KƏRİM (MÜCRİM)

### Yalvarım ona

Munidə kim var deyim yar vəfadarım ona,
Çökübən xəlvətə bir sirr açım əsrarım ona,
Göstərim dağ və dilim, söyləyim azarim ona,
Hanı bir dərd bilən bir para yalvarım ona.

XXX

Qələm qaşları yay, kilsəyə döndərdi məni,
Ay kimi əhli şəhr bir-birinə göstərdi məni,
Ah kimi əkdi məni bu dərdlərin dərdi məni,
Hanı bir dərd bilən bir para yalvarım ona.

XXX

Pəri tələtli sənəm çox, vəli adəmligi yox,
Bağadək bir kəs ilən həmruhu möhkəmliyi yox,
Eyləsə mehrü vəfa zərrəcə möhkəmligi yox,
Hanı bir dərd bilən bir para yalvarım ona.

XXX

Haçanadək qəm hicrinə düşim, qəmdə əlim,
Rüz vəslinə anın yeməsəm ol dəsdə elim,
Dəkmə mürcim Kərimə, qoy məni ölsəmdə ölim,
Hanı bir dərd bilən bir para yalvarım ona.

## Təcnis

Səhər dost zülfünə şanə çəkəndə,
Yayılar aləmə abulər bular.
Hər kəs sidq ilə Murad eylər,
Əlbəttə, mətləbin abulər bular.

XXX

Sərrafın dəstidə nadanə didim,
Xalın can quşuna nadanə didim,
Sərim dərd bilməz nadanə didim,
Anlamaz, başını abulər bular.

XXX

Bayqu üçün məskən oldu o diyar,
Qəmzən ilən bağrim başin o diyar,
Evdən çıxdi yalın qilic o diyar,
Bilmirəm qanimə abulər bular.

XXX

Aşiqi kələbək tək kim dərdə saldi,
Gönlünün şəbnəmini kim dərdə saldi,
Mücrim Kərimi kim dərdə saldi,
Ah çəkib göstər abulər bular.





## İstər

Yüz mahi minəvvər ola, gönlüm səni istər,
Yüz Şəmaye münəvvər ola, gönlüm səni istər,
Yüz sərvü sənübər ola, gönlüm səni istər,
Yüz sariyi-gövhər ola, gönlüm səni istər,
Yüz qaməti ər-ər ola, gönlüm səni istər,

XXX

Yüz mah-məsəl, afəti can, gözləri xumar,
Yüz sib-zəqən, qınçə dəhan, nərgizi-bimar,
Yüz zülfü pərişan bəla-çü, büti-xunxar,
Yüz qaşi kaman, şux pərizad, cəfakar,
Yüz kipriyi xəcər ola, gönlüm səni istər.

XXX

Yüz ləl kəhraba ola, yüz gülçəni rəngin,
Yüz qaşı kaman, incə miyan, ləbləri şirin,
Yüz qaməti rəna ola, yüz kakili pərçin,
Yüz mahi-məlahət, büti-ziba, küli-nəsrin,
Yüz zülfi müənbər ola, gönlüm səni istər.

# QADIN ŞAİRLƏR



XIX əsrdə Şəkidə Xalisə - "Qarı" Mahtab və Mah adlı xanım şairlər də yaşayıb yaratmışlar.

Xalisə Hacı Bayram qızı XVIII əsrin ikinci yarısında varlı-ziyalı ailəsində anadan olmuşdur. Atasının evində qonaq olan ziyalılar və şairlər kiçik Xalisənin əzbərdən dediyi qoşma və bayatılardan həzz alaraq, atasına Xalisəni oxudub savadlandırmasını məsləhət görmüşlər. Hacı Bayram kişi də bu tövsiyələri yerinə yetirərək, xüsusi müəllim vasitəsilə qızını savadlandırmışdır. Xalisə böyüdükcə şeirə və elmə həvəsi artmış və özü orijinal qoşmalar yazmağa başlamışdır. O, həmyaşıdı olan kiçik qızların savadsız, hüquqsuz vəziyyətlərinə acıyaraq öz evlərində qızlar üçün məktəb təşkil etmiş, onlara savad öyrətmişdir. Bununla kifayətlənməyərək, atasının yardımı ilə kiçik ev kitabxanası da yaratmışdır.

Kiçik yaşlarında özünü böyüklərdən daha fərasətli apardığı, dərin mənalı söhbətlər etdiyi üçün qocalar ona "Qarı" ( qoca, çox bilmiş) təxəllüsü vermişlər.

O, özündən sonrakı nəslinə örnək olmuşdur. Bunun nəticəsidir ki, onun nəslindən Əbdüllətif əfəndi "Nuxəvi" kimi tarixçi alim yetişmişdir.

XIX əsrdə Xalisə qarının yolu ilə gedən Mahtab və Mah xanımlar da bir sıra lirik eşq-məhəbbət şeirləri ilə tanınmışlar.

Onların şeirlərindən o dövrdəki qadın hüquqsuzluğu, evdən çölə çıxmamaları və üzü açıq gəzmələri qadağan edildiyi üçün sevib-sevilə bilmədiklərindən çox vaxt evdə

qız qalıb qarıdıqları, üzünü görmədiyi adamlara ərə verildikdə belə sevindikləri aydın şəkildə duyulur və hiss edilir.

Bu cəhətdən onların bir-birlərinə yazdıqları şeirlərdən aşağıda göstərilən parçalar olduqca səciyyəvidir:

Mahtab xanım:

"Mahutabam yaman günüm keçildi,
Dolandı saqilər, badə içildi,
Gözün aydın olsun, baxtım açıldı,
Bir ali nəsibi sevmişəm indi"

Mah xanım:

"Mah xanımam bu sinəmi dağlaram,
Öz yarami öz əlimlə bağlaram,
Gecə-gündüz sızıldaram, ağlaram,
Qəm çərisi sinəm üstə töküldü".

Şeirlərindən nümunələr:

**MAHTAB XANIM**

Bu gün

"Başına döndüyüm ay Mah xanım,
O güllü bağlara varmışam bu gün,
Gecə-gündüz can və dildən sevdigim,
Qonça güllərini dərmişəm bu gün.





XXX

Səhərdən vardım o gözəl bağa,
Bir tutu quşu gəldi, qondu budağa,
Mübarək qələmin basdı otağa,
Gizli sirrimi vermişəm bu gün.

XXX

Dolanım başına, düşüm ayağa,
Bir canım var yara qurban sadağa,
Əlimdə piyalə qabax-qabağa,
Yarımı yuxuda görmüşəm bu gün.

XXX

Möhtabam yaman günüm keçildi,
Dolandi saqilər, badə içildi,
Gözün aydın olsun, baxtım açıldı,
Bir ali mənsəbi sevmişəm bu gün.

## MAH XANIM

Söküldü

"Ağzın bal, dilin şəkər, Mahtab,
Yenə ciyərimin başı söküldü,
Gündüz qərarım yox, gecələr bixab,
Kor oldu gözlərim, belim büküldü.

XXX

Yenə yaraxlılar durmuş qəsdimə,
Ya allahım, damən düşdü dəstimə,
Bu hicran ləşkəri gəldi üstümə,
Hər tərəfdən hücum etdi, töküldü.

XXX

Hicran odunda mən olmuşam kabab,
Gündüz qərarım yox, gecələr bixab,
Başın üçün doğru sözdü, Mahtab,
Ürək parçalandı, ciyər söküldü.

XXX

Mah xanımam, bu sinəmi dağlaram,
Öz yaramı öz əlimlə bağlaram,
Gecə-gündüz sızıldaram, ağlaram,
Qəm çərisi sinəm üstə söküldü."



# XALQ AŞIQLARI

## NOVRUZ

XIX əsrin sonlarında Şəkidə xalq aşıq şeiri də inkişaf etmişdir. O dövrdə poeziyanın bu növünün nümayəndələri az tanınan Aşıq Novruz, Aşıq Donu və görkəmli Aşıq Molla Cümə olmuşlar.

XIX əsrin birinci yarısında Şəkidə doğularaq, orada da yaşayıb yaratmış şair-aşıq Novruzun doğulduğu və vəfat etdiyi il məlum deyildir.

Aşıq Novruz şeirlərində insanları dostluğa, həmdəm olmağa, düz danışıb, düzgünlüklə həyat sürməyə çağıran bir şair olmuşdur. Onun "Dağlar" və "İmdad" şeirləri təbiət gözəlliyini, insanın insana köməyə gəlib imdad göstərməsini tərənnüm edən şeirlər kimi qiymətlidir:

"Dedim, gəl dost, ikimiz həmdəm olalı
Ağı mən oxuyum, qara sən qarə,
Dedim bir dəm qan salmayaq araya
Yeri rəqib üzü qarasan qara".
Şeirlərindən nümunələr:

### Dağlar

"Ey dağlar tərki vətən olmuşam,
İtirdim Qəndabtək maralı, dağlar,
Bu çiskin, bu duman səndə müqərrər,
Çox çiraqlar səndə qarali, dağlar.





XXX

Qarlı dağlar gündən-günə qan eylər,
Bu duman, bu çiskin nə yaman eylər,
Burda ölməyimi kim güman eylər,
Gen dünya başıma darali dağlar.

XXX

Bu dağın ucu Şəki dağıdır,
Sanasan çövrəsi cənnət bağıdır,
Tuyğun, tərlan, laçın yığnağıdır,
Sonalar, arzılar saralı dağlar.

XXX

Mən Novruzam içdim yar ilə badə,
Badə içib irişdim xoş murada,
Soyuq bulaqlarda, çəmənli yerdə
cayib yaslanıb arali dağlar."

## İmdad

Qarlı dağlar yenə itdi arandan,
Kərəm elə, qoyma məni dəryada,
Ərşi kürsi, insi cinni yarada,
Kərəm elə, qoyma məni dəryada.

XXX

Necə oldu mənim ilə varanlar,
Dəryayə qərq oldu neçə min canlar,
Ənbiyalar, evliyalar, ərənlər,
Kərəm elə, qoyma məni dəryada.

XXX

Nagah rast oldu mehrabi gəmi,
İçinə yığıldı ərənlər hami,
Dadıma yetiş sən Məhəmməd, Nəbi,
Kərəm elə, qoyma məni dəryada.

XXX

Yüz iyirmi dörd Nəbi, səhabə,
Siz də yetin olan dərdü-səhabə,
Dut Novruzun dilbəndini qəndabə,
Kərəm elə, qoyma məni dəryada" .





## MOLLA CÜMƏ

Azərbaycan aşıq poeziyasının görkəmli nümayəmdələrindən biri də Molla Cümədir. Molla Cümə 1854-cü ildə Şəki mahalının Aşağı Layısqı kəndində, kasıb kəndli ailəsində anadan olmuşdur. Təhsilini doğma kəndinin yaxınlığında bir sıra ziyalıların yetişdiyi Baş Köynük kəndindəki mədrəsədə almışdır. O, bu mədrəsədə ərəb və fars dillərini öyrənməklə klassik Şərq ədəbiyyatı ilə dərindən tanış olmuşdur. Görkəmli böyük saz sərrafları Aşıq Qurbani, Tufarqanlı Abbas, Aşıq Alı və Aşıq Ələsgərin şeirləri ilə tanışlıq onda aşıq poeziyasına dərin maraq və həvəs yaratmışdır.

Bu maraq və sevgi istedadı və şairlik təbi nəticəsində onu orijinal aşıq səviyyəsinə yüksəltmişdir.

Molla Cümə öz yaradıcılığında klassik Şərq ədəbiyyatı və aşıq sənəti ənənələrini məharətlə davam etdirmişdir. Gözəllik aşiqi olması, saf məhəbbəti, elinə və taleyinə münasibəti onun gözəl şeir nümunələri yaratmasına səbəb olmuşdur.

Molla Cümə qələmini aşıq şeirinin bütün formalarında sınamışdır: qoşma, gəraylı, təcnis, müxəmməs, müqəddəs, mnacat, gözəlləmə və başqa formalarda klassik şeir nümunələri yaratmışdır. Bu nümunələr içərisində "Qızla gəlinin deyişməsi", "Qafiyə və təcnis", "Dübeyti misalı", "Aşıq Gönüllə deyişməsi", "Aşıq Donu ilə deyişməsi" kimi iri həcmli əsərlər, "Baxşı bəylə Leyli xanım", "Sayat və Sayalı" kimi dastanlar da vardır. Məhəbbət şeirləri ilə yanaşı, dövründən və dövrün zalım hakimlərindən şikayət xalqın qanını soran qoluzorluları ifşa edən şeirlər yaradıcılığı xüsusi səciyyə daşıyır.

Molla Cümə məhəbbət şeirlərinin çoxunda özünün uğursuz məhəbbətindən söz açır. Lakin sevgilisinə müraciətlə yazdığı şeirlərinin heç birində sevdiyi, vüsalına yetişə bilmədiyi gözəlin adını çəkmir, onu "İsmi pünhan" adlandırır. Bu şeirlərdə sevgi yolunda çəkdiyi dərd-qəm, vüsal həsrəti və iztirablar, qadın hüquqsuzluğunun törətdiyi bəlalar, bu bəlaların törənməsinə bais olan geri qalmış nadan, cahil, avam dindarlardan şikayət öz əksini tapmışdır. Xüsusilə saf məhəbbəti anlamayan mövhumatçılara etiraz motivləri güclüdür. Bu kimi şeirlərdə fəlsəfi-didaktik fikirlər sənətkarlıqla ifadə edilmişdir. Gözəl və güclü lirikaya malik bir sıra şeirlərinə musiqi yazılsa da, bir çox şeirləri el nəğməsi, xalq mahnısı kimi xalq arasında dillərdən düşmür:

"İsmi-pünhan, niyə məndən küsübsən?
Dost-mehriban ya bir olar, ya iki,

XXX

Sən şöləsən, dörd yanında fanaram,
Bülbülünəm, gülşənimdən kənaram,
Hər məclisdə od tutuban yanaram,
Halım soran ya bir olar, ya iki.

XXX

Hilal qaşa nə yaraşır o sürmə?
Yalvarıram üzün məndən çevirmə,
Cümə deyər: hər yetənə sirr vermə,
Sirri qanan ya bir olar, ya iki".





Aşığın şeirlərində şadlıq təranələri əsas yer tutsa da, qəmli şeirləri də vardır. Uzun illər sevgilisinin adını "Pünhan" saxlayan aşıq sevgilisinin ölümündən sonra bu sirri açır. "Dilbər" şeirindən məlum olur ki, onun "İsmi pünhan" adlı sevgilisi din xadiminin qızı Məryəm imiş. Atasının onun saf məhəbbətinə mane olan rəzilliklərindən dərdə düçar olaraq, ölmüşdür.

Məryəmin ölümündən kədərlənən aşiq "Bəzənir," "Hayıf oldu" və "Qalacaqmı?" kimi kədərlə dolu qüvvətli şeirlərində bu əvəzsiz itkidən doğan kədərini aşağıdakı kimi ifadə etmişdir:

"İsmi-pünhan köçdü fani dünyadan,
Qarışdı torpağa, göz hayıf oldu.
Xudanın tədbiri beləymiş bizə,
Soldu yanaqları, üz hayıf oldu".

Var-dövlət hərisliyi ilə zəhmətkeşlərin qanını soran xanlar, bəylər, mollalar və din pərdəsi altında gizlənib pis əməllər törədən hacıları

"Əlinizdə əlaman batdı
vilayət hacılar,
Yüz cürə bədbəxtliyə çatdı
vilayət hacılar"

kimi misralarla ifşa edən aşığın düşmənləri onu getdikcə daha ciddi təqib etməklərindən qorxmayaraq, onlara məğrurluqla belə cavab verirdi:

"Gəl girmə Cümənin qızğın sacına,
Dözə bilməzsən istisinə, gücünə,
Gəlməz qulağıma, girməz vecimə,
Sənin kimi iki yüzü mırtdasın".

Molla Cümə həyatı boyu vətən sevgisi ilə yaşayaraq öz şeirlərində bu sevgini insanlara təlqin etməyə çalışmışdır:

"Vətənimin sısqa sərin bulağı,
Yad ellərin gur çayından yaxşıdır.
Öz evimin quru cadı, ayranı,
Qonşu verən yağ payından yaxşıdır".

Buna görə də o insanları hər zillətə düçar olsalar da mərdanə həyat sürüb vətəni abadlaşdırmağa çağırır:

"Molla Cümə, sən də danış mərdana,
Gah zəlil dolandın, gah da divana,
Öz yurdunda tiksən kiçik bir bina,
Çox şahların sarayından yaxşıdır"

Aşıq gələcəyə böyük ümid bəsləyərək, xalqı zalımlara qarşı daha ciddi mübarizə aparmağa çağırır:

"Cümə bir bülbüldür fəna dünyada,
Sözləri düşəcək sana dünyada,
Vuraq zərbə bəyə, xana dünyada,
Azadlıqdan xoş bir səda eşitdim" .





Molla Cümə 1920-ci ildə Şəkinin Aşağı Layısqı kəndində vəfat etmiş və orada da dəfn edilmişdir.

Keçmiş Sovet hakimiyyəti dövründə seçilmiş əsərləri iki dəfə nəşr edilmişdir.

Şeirlərindən nümunələr:

**Dönməz**

"Bir gözələ gözüm düşdü,
Mən dönərəm, gözüm dönməz,
Ruhum getdi, əqlim çaşdı,
Mən dönərəm, gönül dönməz.

XXX

Dərdimi söylərəm başdan,
Ay qabaqdan, qələm qaşdan.
Şirin dilli bir ölmüşdən,
Mən dönərəm, gönül dönməz.

XXX

Molla Cümə eylə dastan,
Mail baxan, gözü məstan,
Bir vəfalı, sevən dostdan,
Mən dönərəm, gönül dönməz".

## Sənin

"Gözəl səndən xəbər alım,
De əndamın qarmı sənin?
Dilin şirin, ağzı ballım,
Bizə rəhmin varmı sənin?!

XXX

Qəddin çinar, sinən şişə,
Dişlərin oxşar gümüşə,
Buxaqların gül-bənövşə,
Yanaqların narmı sənin?!

XXX

Döşündə bir cüt şamama,
Nə yaraşır gül əndama,
Layıqlı Molla Cümə,
Doğru söylə yarmı sənin?!.

## Əziz yarım

"Mən gedirəm halallaşaq,
Salamat qal, əziz yarım.
Aç qolunu gəl, sarmaşaq,
Salamat qal, əziz yarım.

XXX

Dolubanı daşmaginən,
Dərdi qəmə düşməginən,





Bu sirrləri açmaginən,
Salamat qal, əziz yarım.

XXX

Bu yerləri tərk etmərəm,
Gözəl ismin unutmaram,
Səndən özgə dost tutmaram,
Salamat qal, əziz yarım.

XXX

Ləblərin bənzəyir qəndə,
Amanatım dursun səndə,
Yadigardır telin məndə,
Salamat qal, əziz yarım.

XXX

Gözüm yaşı çağlar gedir,
Sinəm üstə dağlar gedir,
Molla Cümə ağlar gedir,
Salamat qal, əziz yarım.

## Gəlsin

"Ay həzərat dərdə doldum,
Dərddən xəbər bilən gəlsin,
Ağlamaqdan gözdən oldum,
Qan yaşımı silən gəlsin.

XXX

Bir kimsə gəlmir yanıma,
Şərik olmur hicranıma,
Düşmən susayır qanıma,
Dostlarımdan gülən gəlsin.

XXX

Bivəfa durmayır əhtdə,
Tanımayır saat, həftə,
Molla Cümə, mən sifətdə,
Əcəl canım belən gəlsin".

**Ağlaya-ağlaya**

Bir ərzim var, ol xudaya,
Qıllam ağlaya, ağlaya,
Yetirməsə muradıma,
Qallam ağlaya, ağlaya.

XXX

Sürmədim zövqü səfanı,
Çəkirəm cövrü cəfanı,
Xalq içində Nuh tufanı,
Sallam ağlaya, ağlaya.

XXX

Nə yanırsan dəli gönlüm,
Yarın səni etməz qəbul,





Xidmətində istəsən qul,
Qallam ağlaya, ağlaya.

XXX

İçdim eşqin badəsini,
Keçdim Nilin adasını,
İsmi Pünhan qadasını,
Allam ağlaya, ağlaya.

XXX

Mən Cüməyəm qəm alıcı,
Şirin cana od salıcı,
Öz ömrümə dərd qılıncı,
Çallam ağlaya, ağlaya .

**Sən nəsən?**

Durubsan meydanda özünü çəkib,
Bu meydanda mən aslanam, sən kimsən?
Girərəm ortaya qaş-qabaq töküb
Çillə kimi qor salanam, sən kimsən?

XXX

Çox aşığı məclislərdən qaçırram,
Nöyütləyib, alışdırıb, uçurram,
Cəllad kimi cəngəlimə keçirrəm,
Əzrailtək can alanam, sən kimsən?

XXX

Cümə deyər bu meydanda nər mənəm,
Sərrafların dükanında zər mənəm
Acıqlansan oysununa girmərəm,
Bəd qılıqlı, tərs ilanam, sən kimsən?

## Adam var

Adam var təkəbbür, ölsə acından,
İnsana bildirməz, amansız yatar.
Adam var bir barmaq balın ucundan,
Dağıdar, tutluğun dibini yırtar.

XXX

Adam var danışar eldən ötəri,
Adam var danışar dildən ötəri,
Adam var fitnəylə-feldən ötəri,
Dostu oda salar, dəryaya atar.

XXX

Adam var məclisdə gönlünü açar,
Adam var söz söylər, keyfini açar,
Adam var qorxuban dovşandan qaçar,
Adam var aslanı kəməndlə tutar.

XXX

Adam var ki, danar həst-nistini,
Adam var ki, tutar mərdlik dəstini,
Adam var ki, Cümə kibi dostunu,
Kim baha danışar, qəlb pula satar.





## Qayıt gəl

"Yar çünki gedirsən, səfər edirsən,
Halımı görürsən, tezcə qayıt gəl,
Atına suvarsan, dərddən xəbərsən,
Allahı sevərsən, tezcə qayıt gəl.

XXX

Gözlərəm yolunu, sağı solunu,
Aç dola qolunu, qucum belini,
Sevindir qulunu, yeyim dilini,
Unutma dalını, tezcə qayıt gəl.

XXX

Cüməyəm, niyazım, ey xumar gülüm,
Od tutar kağızım, özgə nə yazım,
Bilirsən hər sözüm, deməm nə lazım,
Amandır, əzizim tezcə qayıt gəl.

## Neylim

"Ay ağalar, müşkül işə düşmüşəm,
Bu qəflətdən bəxtim oyanmaz, neylim?
Pərvanətək dilə-dişə düşmüşəm,
Axıban göz yaşım dayanmaz, neylim?

XXX

Həsrətdən gəlmişəm cana, amana,
Ümidim bağladım axır zamana,

Danışdım dərdimi ismi pünhana,
Bu zalım bivəfa inanmaz, neylim?

XXX

Molla Cümə, qəm hicranı cuğlayır,
Yığıbanı qiyamətə saxlayır.
Mən burda yanıram, özü yuxlayır,
Allahdan qorxmayır utanmaz, neylim?!

**Ağlayır**

İsmi pünhan sinəmizi dağladın,
Sənin üçün necə canlar ağlayır,
Çün tay-tuşun yollarını bağladın,
Yüzün görən mehribanlar ağlayır.

XXX

Nə səbəbdən kəsdin bizdən aranı,
Kim bağlayar bu təbibsiz yaranı,
Qohum-qardaş cümlə geyib qaranı,
Dostun dostdur, cəm düşmənlər ağlayır.

XXX

Düşübdür yadına sərvi boyların,
O şirin sözlərin, gözəl xoyların,
Heykəldə yadigar duran muyların,
Bu Molla Cüməynən qanlar ağlayır .





**Yaxın gəl**

"Aşığın xəstədir, təbib olginən,
Getmə uzaq, dərdə dərman, yaxın gəl.
Bir saat gəlməsən, yəqin bilginən,
Əldən çıxar dinlə iman, yaxın gəl.

XXX

Dərdimi söylərəm dərdli kəslərə,
Sirrim danışmaram hər nakəslərə,
Qulaq as, ağzımdan çıxan səslərə
İnsaf eylə, a mehriban yaxın gəl.

XXX

Uzaqdı mənzilim çata bilmirəm,
Bu canımi canına qata bilmirəm,
Ürkmüsən ovçundan, tuta bilmirəm,
Qorxma, yoxdu əldə kaman, yaxın gəl.

XXX

Ey mənim əzizim, ey mənim gülüm,
Ördəyim, qazımsan, tuti bülbülüm,
Qohumum, qardaşım, vətənim, elim,
Cümlə olsun sənə qurban, yaxın gəl.

XXX

Gəlibsən görginən necədir halım,
Soruş əhvalımı, ey qadan alım,
Dolanım başına, qurbanın olum,
Molla Cümə öldü aman, yaxın gəl.

**Zalım**

İsmi pünhan, nə iş keçdi aradan,
Mən sənin sirrini qanmıram, zalım.
Mən ölürəm sən vurduğun yaradan,
Düşmüşəm eşqinə, sönmərəm, zalım.

XXX

İstər qocalıbsan yüz ola yaşın,
Əgilə qamətin, ağara başın,
Kor ola gözlərin, tökülə dişin,
Gecə alsan canım, dinmərəm, zalım.

XXX

Cüməyəm eşqində yoxdur macalım,
İstər mən də yüz yaşadək qocalım,
Əl hökm ilə gəl yetməsə əcalım,
Yəqin bil mən səndən dönmərəm, zalım.

**Aldanma**

Sevdiciyim, məndən sənə nəsihət,
Hər yetənə, yalançıya aldanma,
Azdırarlar, fərar edər xasiyyət,
Hər gördüyün dilənçiyə aldanma.

XXX

Üç-dörd arşın bekar çitdən ötəri,
Bir girvənkə çəkər-qənddən ötəri,





Avğu olmuş beş qənfitdən ötəri,
Hər çərçiyə, dükançıya aldanma

XXX

Molla Cümə, səni sevdi əzəldən,
Əlin çəkməz sənin kimi gözəldən,
Evlər yıxan, araları düzəldən,
Araçıya, talehçiyə aldanma .

**Aşıqlıq**

Aşıqlıq aləmdə icad olubdur,
Ol Adəm atanın nəvəsiyəm mən.
Nə qədər dünyaya aşıq gəlibdir,
Güllü aşıqların anasıyam mən.

XXX

Aşıq anasıyam, şairlər kökü,
Gəzərəm dünyada divanə təki,
Mahalım Köynükdür, şəhərim Şəki,
Layiqli kəndinin binasiyəm mən.

XXX

Binəm Layisqəyə düşübdür, mehman,
Pədərim Salahdır, madərim Reyhan
Vəlidim Həsəndir, əxim Süleyman,
Familim Molla Oruc Ədnasiyəm mən.

XXX

Ədnayam, Kəntərəm, dərdə dərmanam,
Hənəfi məzhəbəm, Həm müsəlmanam,
Nəbim Məhəmməddir, əhli quranam,
Mömin qardaşların aşnasıyam mən.

XXX

Aşinayam gedərəm doğru yolunnan,
Bülbüləm, söhbətim olar gülünnən,
Danışsalar yetmiş iki dilinnən,
O qədər arifəm, qanasıyam mən.

XXX

Qanıran ustaddan almışam dərsi,
Oxumuşam ərəb, türk ilə farsi,
Fikrim seyr eyləyər ərşinən kürsi,
Dərin kitabların mənasıyam mən.

XXX

Mənada mollayam Molla Cüməyəm,
İsmi pünhan oduna şux pərvanəyəm,
Gəlmişəm cahana, bir gün fanəyəm,
Axırda Kərəmtək yanasıyam mən .

**Gəzər**

Ağrın alım, sənə gözəl deməräm,
Gözəlin zülfündən bir şana gəzər.
Gündə yüz yol sığal verər telinə,
Görəni eyləyər divanə, gəzər.





XXX

Gözəllər geyinər zər ilə ziba,
Görən deyər, səd afərin, mərhaba.
Barmağında üzük, qolda kəhraba,
Boyadıb əllərin xınalı gəzər.

XXX

Bu Molla Cüməni görməyir gözün,
Süzüb gəl qarşıma, bir göstər üzün,
Oğrun daldalarda yaşırma üzün,
Adətdir, gözəllər mərdanə gəzər .

**Sənə yaxşımı**

Səni görüb belə məlul dururam,
Belə məlul durmaq sənə yaxşımı?
Axirət əzabın indi görürəm,
Əzabımı görmək sənə yaxşımı?

XXX

Üç il oldu bir əl-ələ dəymədin,
Dostam deyib, dosta canın qıymadın,
Vallah, məndə heç ixtiyar qoymadın,
Gönlümü sındırmaq sənə yaxşımı?

XXX

İnsafsız gözəlsən, sirrini qandım,
Mən belə bilmirdim, itirdim zəndim,
Amandır, bir su tök alışıb yandım,
Cumanı yandırmaq sənə yaxşımı?.

**Olmazmı**

Dost ilə düşməni niyə qınarsan,
Yar ilə əğyara hicab olmazmı?
Dindirəndə bircə kəlmə dinmirsən,
Məyər sualıma cavab olmazmı?

XXX

Sona tək oğlağın quş binasıdır,
Yaxıbdır əlinə al xınasıdır,
Uzaqdan baxmaqsa göz bəlasıdır,
Yaxından görüşmək savab olmazmı?

XXX

Ləblərin bənzəyir qəndə, nəbata,
Gözəlliyin varmış həddən ziyada,
Cumanın canını salıbsan oda,
Yanıban ciyərim kabab olmazmı? .

**Aşıq Donu ilə Molla Cümənin deyişməsi.**

Aşıq Donu:

Yeri-yeri, çeşmi laçın,
Özgələrə vermə maçın,
Dal gərdəndə siyah saçın,
Hörüb tökər, şana çəkər,
Xına yaxar, tel vay eylər.

Molla Cümə:

Aşıq məşuğundan ayrılsa,
Canı yanar, təşnə vurar,
Yar yadınan gəzən görsə,





Bir ah çəkib, qəddin bükər,
Yaşın tökər, göz vay eylər.

Aşıq Donu:

Yeri-yeri ləbi qönçə,
Boyu uzun, beli incə,
Gözləri oxşar turunca,
Məlul baxar, kəmər taxar,
Belin sıxar, bel vay eylər.

Molla Cümə:

Qiyməti yoxdur maçının,
Müşki ənbəri saçının,
Bəxti dönsə bir ovçunun,
Dağdan keçər, mürvü uçar,
Ceyran qaçar, düz vay eylər.

Aşıq Donu:

Kərəm sevdi əsli xanı,
Uçurdu tülək tərlanı,
Bir yar üçün Aşıq Donu
Qaynar, coşar, həddən aşar,
Ayrı düşsə, el vay eylər.

Molla Cümə:

Fələk qoymur yetəm kamə,
Kim dözər beylə sitama,
Dost boynuna Molla Cümə,
Qolun dolar, qurban olar,
Büsə alar, üz vay eylər.

## DAŞBULAQLI AŞIQ DONU

Aşıq Donu Şəki mahalının Daşbulaq kəndində anadan olmuşdur. Doğulduğu il məlum olmasa da Molla Cümənin müasiri olduğundan məlum olur ki, XIX əsrın ikinci yarısında doğulmuşdur. Molla Cümə ilə deyişməsi onunla dost olmasını təsdiq edir. Donunun istifadə etdiyimiz "İmdi" dördlüyü onun lirika sahəsində vüsətinə bir misaldır:

**İmdi**

"Göz yaşımdan namə yazdım,
Oxuyub dərdimi qanalar imdi
Qürbət eldə hicran tutdu yaxamdan,
Müşküldür halıma yanalar imdi.
XXX
Qoca bülbül tərk eyləmiş bağları,
Naşi quşlar tutmuş zər budaqları,
Necə oldu gönlümün laçın çağları
Gəzər ovlağında sonalar imdi.
XXX
Xudam xub yaradıb bu gözəlləri,
Hər yana tökmüşlər əfşan telləri,
Yada düşür yenə yarın elləri
Yaxa dəstimə xınalar imdi.
XXX
Uçdu tərlan, yerin almış bayquşlar,
Dolanıb kökləri qocaldı qular,
Aşıq Donu keçən günləri arzular,
Necə ah çəkməsin sonalar imdi.



# İSTİFADƏ EDİLMİŞ MƏNBƏLƏR

1. Salman Mumtaz. Azərbaycan ədəbiyyatı, sayı 4, "Məhəmməd Hüseyn xan Muştaq", Bakı, "Kommunist" nəşriyyatı, 1925.
2. Salman Mumtaz. Azərbaycan ədəbiyyatı-el şairləri, Bakı, Azərnəşr, 1935. I-II cildlər.
3. Salman Mumtaz. "Azərbaycan ədəbiyyatı qaynaqları", Bakı, Yazıçı nəşriyyatı, 1986.
4. H.Araslı. "XVII-XVIII əsr Azərbaycan ədəbiyyatının tarixi". Bakı, Azərnəşr, 1949.
5. "Nuxa fəhləsi" qəzeti", sentyabr 1957, sayı 105 (5661).
6. Firudin bəy Köçərli, "Azərbaycan ədəbiyyatı", Bakı, "Elm" nəşriyyatı, 1981, I-II cildlər.
7. Qurtuluş jurnalı. Bakı, 1920-ci il,sayı 2, səh. 13.
8. Molla Cümə. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1983.
9. "Azərbaycan" jurnalı, sayı 4, 1988, səh. 154.

# MÜNDƏRİCAT

**MÜƏLLİFDƏN** ... 3

**ÖN SÖZ** ... 5

**EL ŞAİRLƏRİ** ... 11
Nəbi ... 12
Süleyman ... 24
Hacı Məhəmməd Zare ... 28
Məhəmməd Hüseyn Xan Muştaq ... 32
İsmayıl Bəy Nakam ... 38
Molla Yüsif Raci ... 54
Kərim Ağa Şəkixanov – Fateh ... 60
Molla Qasım Zakir ... 62
Molla Əhməd Əfəndi-Zövqi ... 71
Hacı Mahmud Əfəndi-Nafe ... 76
Hacı Rəsul – "Rəsul" ... 78
Molla Məhəmməd-Hüzni ... 80
Rəsul Dülgər ... 83
Mustafa Ağa-Şuxi ... 88
Məhəmməd Şəmədüz ... 94
Molla İbrahim Xəlil-Dodui ... 97
Dəli Bəbir ... 99
Şəkili Hüseyn Qəmnak ... 100
Şəkili Hatəm ... 101
Şəkili Cami ... 104





Şəkili Osman (Biçarə) ... 106
Şəkili Molla Turab (Birinci) ... 108
Şəkili Lələ ... 114
Qışlaqlı Şair Molla Məhəmməd ... 116
Göynüklü Mahmud Əfəndi ... 119
Padarlı Abdulla Əfəndi ... 122
Vardanlı Kərim (mücrim) ... 125

**QADIN ŞAİRLƏR** ... 128
Mahtab xanım ... 130
Mah xanım ... 132

**XALQ AŞIQLARI** ... 133
Novruz ... 134
Molla Cümə ... 137
Daşbulaqlı Aşıq Donu ... 156

**İSTİFADƏ EDİLMİŞ MƏNBƏLƏR** ... 157

| | |
|---|---|
| Mətbəənin direktoru | – Fuad HÜSEYNOV |
| Texniki redaktor | – Azər RƏSULOV |
| Dizayner | – Kəmalə FƏRHADOVA |
| | – Məhiyəddin SEYİDOV |
| Kompüter yığımı | – Təranə RƏHİMOVA |
| Cildçi | – Gövhər NURULLAYEVA |
| Çapçı | – Oqtay YUSİFOV |

*Kitab "AFPoliqrAF" mətbəəsində hazır diapozitivlərdən ofset üsulu ilə çap olunmuşdur.*

afpoliqraf@mail.ru | Tel.: +994 (12) 510 96 74
afpoliqraf@gmail.com | Mob.: +994 (50) 405 96 74

Yığılmağa verilmişdir: 11.05.2020
Çapa imzalanmışdır: 12.06.2020
Qarnitura: Futurica Light, Palatino Linotype, Times New Roman
Şərti çap vərəqi: 10
Formatı: 62x86 1/8
Tiraj: 100



**Əbdürəhman Məmməd oğlu Abdullayev** 1914-cü ildə Şəki şəhərində anadan olmuşdur. 1933-cü ildə Şəki Pedaqoji Məktəbini bitirərək, müəllimliyə başlamışdır. 1937-41-ci illər Şəki 11 saylı orta məktıbdə dərs hissə müdiri, 12 saylı məktəbdə direktor, Şəki rayon Maarif Şöbəsinin müdiri vəzifələrində işlədiyi ərəfədə Azərbaycan Pedoğoji institutunun qiyabi şöbəsinə daxil olaraq, institutun dil-ədəbiyyat fakültəsini bitirmişdir. 1942-ci ildə Azərbaycan Maarif Nazirliyi idarəsində baş müfəttiş, 1945-ci ildə Azərbaycan KP-nın qərarı ilə Şəkinin Ümumittifaq əhəmiyyətli məktəb yaşlı oğlanlar evinin direktoru, 1947-ci ildə Azərbaycan KP Şəki şəhər Komitəsinin təbliğat və təşviqat şəöbəsinin müdiri, 1950-ci ildə Azərbaycan siyasi və elmi bilikləri yayan cəmiyyətin Şəki rayonlar arası şöbəsinin məsul katibi, 1957-ci ildə isə Azərbaycan KP Şəki şəhər Komitəsinin katibi vəzifəsinə seçilmişdir. 1961-cı ildə Azərbaycan Elmlər Akademiyasına kadrlar şöbəsinin rəisi vəzifəsinə keçmişdir. 1963-cü ildə filologiya elmləri namizədi elmi dərəcəsini almışdır. Rəşid bəy Əfəndiyevin həyatı və yaradıcılığı haqqında iki kitab yazmış, 30-dan artıq elmi məqalələri nəşr edilmişdir. 1966-cı ildən Azərbaycan EA Nizami adına Ədəbiyyat Muzeyində məktəblər şöbəsinin müdiri vəzifəsində çalışmışdır.

1938-ci ildən müntəzəm olaraq Azərbaycan KP Şəki şəhər Komitəsi plenumunun üzvü və Şəki şəhər Soveti deputatı seçilmişdir.

"Qırmızı Əmək Bayrağı" ordeni və müxtəlif medallarla təltif olunmuşdur. 1993-cü ildə Prezidentin fərmanı ilə ona "Əməkdar Mədəniyyət İşçisi" fəxri adı verilmişdir.

1997-cı ildə Şəki şəhərində vəfat etmişdir.

1999-cu ildə Şəki şəhər İcra Hakimiyyətinin və Azərbaycan Nazirlər Kabinetinin sərəncamı ilə Şəki şəhər 21 saylı orta məktəbə onun adı verilmişdir.


9 789952 475357